QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Oktyabr 2014
08 (1062)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Gənclər siyasəti üzrə birinci qlobal forumun iştirakçılarına



**Hörmətli forum iştirakçıları!**

Sizi ölkəmizin paytaxtı Bakı şəhərində salamlayır, mötəbər toplantınızın işə başlaması münasibətilə təbrik edirəm.

Gənclər siyasəti öz müstəqilliyini 23 il əvvəl bərpa etmiş Azərbaycan dövlətinin fəaliyyətində prioritet istiqamətlərdəndir. Bu siyasəti uğurla həyata keçirmək üçün ölkəmizdə əlverişli sosial-iqtisadi və ictimai-siyasi şərait yaradılmışdır. Son illər aparılan ardıcıl islahatlar sayəsində iqtisadiyyatımız sürətli inkişaf yoluna qədəm qoymuş, əhalinin bütün təbəqələri, o cümlədən gənclər arasında yoxsulluğun və işsizliyin səviyyəsi əhəmiyyətli dərəcədə azalmışdır. Təhsil, səhiyyə, mədəniyyət və idmanın maddi-texniki bazası möhkəmlənmiş, cəmiyyətdə davamlı sabitlik bərqərar olmuş, əsrlər boyu xalqımıza xas olan qonaqpərvərlik ənənələri və tolerantlıq mühiti daha dərin kök salmışdır.

Gənc nəslin intellektual, fiziki və mənəvi inkişafının təmin edilməsi, yaradıcı potensialının üzə çıxarılması, ictimai fəallığının artırılması, sosial-məişət və məşğulluq problemlərinin həlli sahəsində kompleks tədbirlərin görülməsi daim diqqət mərkəzindədir. Bu məqsədlə son 10 ildə müvafiq dövlət proqramları təsdiqlənərək icra edilmiş, gənclər təşkilatlarının və ayrı-ayrı gənclərin layihə və təşəbbüslərinə dəstək verən fond yaradılmışdır.

Sosial-iqtisadi inkişafın sürətləndirilməsi və mükəmməl infrastrukturun formalaşdırılması istiqamətində həyata keçirilən layihələr, müxtəlif ölkələr və beynəlxalq təşkilatlarla qurulan ikitərəfli və çoxtərəfli əlaqələr, irimiqyaslı tədbirlərin təşkili sahəsində qazanılmış zəngin təcrübə son illər Azərbaycanın region, qitə və dünya səviyyəli forumlara, konfranslara, zirvə toplantılarına və idman yarışlarına ev sahibliyi etməsinə imkan vermişdir. Əminəm ki, bu gün işə başlayan Gənclər siyasəti üzrə birinci qlobal forum da həmin tədbirlər sırasında layiqli yer tutacaqdır.

Biz ilk forumun Bakı şəhərində keçirilməsi barədə qərarı ölkəmizin gənclərlə iş sahəsindəki təcrübəsinə verilən yüksək qiymət kimi dəyərləndiririk. Hesab edirik ki, bu toplantı qloballaşmanın geniş vüsət aldığı müasir dövrdə gənclər siyasətinin prioritetlərinin dəqiqləşdirilməsi, problemlərin həlli yollarının araşdırılması, iştirakçı ölkələrin dövlət orqanları və qeyri-hökumət təşkilatları arasında təcrübə mübadiləsinin aparılması baxımından əhəmiyyətli olacaq, səmərəli müzakirələrlə yadda qalacaqdır.

Forumun işinə uğurlar, hər birinizə möhkəm cansağlığı arzulayıram.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 28 oktyabr 2014-cü il*

# Elmi Şuranın iclasında

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının oktyabr ayının 14-də keçirilən iclasını universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açmış, öncə 2013-2014-cü tədris ilinin yekunlarına görə "İlin müəllimi" nominasiyası üzrə müsabiqə qaliblərinin (humanitar elmlər üzrə - II yer, dosent Fərahim Zeynalov; III yer, professor Nəbi Əsgərov; Dəqiq və təbiət elmləri üzrə-III yer, dosent Zemfira Tağıyeva) diplomlarını təqdim etmişdir.**



Sonra 2013-cü il üzrə keçirilən "İlin alimi" müsabiqəsinin nəticələri elan olunmuşdur. Qaliblərlə oxucuları da tanış edirik:

**Pedaqogika-metodika ixtisasları üzrə**

*I yer - Həqiqət Hacıyeva - 469 bal*

*II yer - professor Azadxan Adıgözəlov - 235 bal*

*III yer - dosent İsa İsmayılov - 224 bal*

**Humanitar elmlər üzrə**

*I yer - professor Buludxan Xəlilov - 725 bal*

*II yer - professor Əzizxan Tanrıverdiyev - 425 bal*

***Dəqiq və təbiət elmləri üzrə***

*I yer - professor Vəli Qurbanov - 195 bal*

*II yer - professor Rauf Sultanov - 184 bal*

*III yer - professor Rəhim Rzayev - 142 bal*

***

Sonra yeni tədris ilinin planları təsdiq edilmişdir.

***

"Pedaqoji Universitetdə attestasiya və akkreditasiyanın keçirilməsi haqqında" çıxış edən Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov attestasiya və akkreditasiyanın 2015-ci ilin mart ayında keçiriləcəyini, bu məsələ ilə əlaqədar fakültə dekanlarının, kafedra müdirlərinin məlumatlandırıldıqlarını və lazımi sənədlərin aidiyyətli qurumlara çatdırıldığını söyləmişdir. Professor M.Cəbrayılovun çıxışından o da məlum olmuşdur ki, qarşıya qoyulan bu vacib işin öz həllini lazımi səviyyədə tapması üçün universitetdə Özünütəhlil Komissiyası yaradılmışdır. Komissiyanın tərkibinə universitetin prorektorları, fakültə dekanları, kafedra müdirləri və bəzi şöbələrin müdirləri daxil edilmişlər.

Elmi Şura yeni yaradılmış komissiyanın sədrini seçmişdir. Universitetin Tədris işləri üzrə prorektoru, professor M.Cəbrayılov komissiyanın sədri seçilmişdir.

Özünütəhlil Komissiyasının fəaliyyətinin əsas məsələlərindən bəhs edərkən professor M.Cəbrayılov Azərbaycan Respublikası Nazirlər Kabinetinin 28 sentyabr 2010-cu il tarixli 167 №-li qərarı ilə təsdiq edilmiş "Təhsil müəssisələrinin akkreditasiyası qaydaları"na müraciət edərək onun bəndbənd geniş şərhini vermiş və komissiyanın bu işi noyabr ayında başa çatdırmalı olduğu fikrini vurğulamışdır.

Qaydalarda Özünütəhlil Komissiyasının fəaliyyəti ilə bağlı bəndi oxucularda təqdim edirik.

**3. Təhsil müəssisəsinin özünütəhlili**

3.1. Özünütəhlilin əsas məqsədi aşağıdakılardır:

- akkreditasiyada təhsil müəssisəsinin bilavasitə iştirakını təmin etmək;
- təhsil proqramları üzrə hazırlığın məzmununa və keyfiyyətinə daxili nəzarət mexanizmini yaratmaq;
- təhsil müəssisəsinin özünüqiymətləndirməsini təmin etmək.

3.2. Təhsil müəssisəsinin rəhbəri Elmi (Pedaqoji) Şuranın qərarı əsasında özünütəhlilin aparılması və bu proseduru həyata keçirəcək komissiyanın tərkibi haqqında müvafiq əmr verir. Təhsil müəssisəsinin rəhbərinin müavinlərindən biri komissiyaya sədr təyin edilir. Komissiya bu Qaydaların 2.6-cı bəndinə uyğun təşkil olunur.

Komissiya müvafiq əmrlə müəyyən olunmuş müddətdə özünütəhlilin nəticəsinə dair hesabat hazırlayır və onu Elmi (Pedaqoji) Şuranın müzakirəsinə təqdim edir. Həmin hesabat Şuranın qərarı əsasında müəssisənin rəhbəri tərəfindən təsdiq edilir.

3.3. Özünütəhlilin nəticələrinə dair hesabatın strukturu

3.3.1. Təhsil fəaliyyətinin təşkilati-hüquqi təminatı

Təhsil müəssisəsinin fəaliyyətinin təşkilati-hüquqi təminatını müəyyənləşdirmək üçün onun fəaliyyətinin qanunvericiliyin tələblərinə uyğunluluğunun təhlili aparılır.

3.3.2. Təhsil müəssisəsinin idarəetmə olunması

Təhsil müəssisəsinin idarəetmə sisteminin qiymətləndirilməsi üçün aşağıdakılar nəzərə alınır:

- idarəetmənin müəssisənin nizamnaməsinin tələblərinə uyğunluğu;
- təhsil müəssisəsində hazırlanmış tədris sənədlərinin mövcud qanunvericiliyə və bu Qaydaların tələblərinə uyğunluğu;
- təhsil müəssisəsinin struktur bölmələrinin qarşılıqlı fəaliyyətinin təşkili;
- təhsil müəssisəsinin idarə edilməsinin 4 funksiyasının (qiymətləndirmə, tənzimləmə, informasiya təminatı, nəzarət) həyata keçirilməsinin vəziyyəti.

3.3.3. Təhsil proqramları üzrə hazırlığın məzmunu və strukturu

Təhsil proqramları üzrə hazırlığın məzmunu onun dövlət təhsil standartlarının tələblərinə uyğunluğu və bu hazırlığı təmin edən müvafiq tədris-metodik sənədlərin təhlili əsasında qiymətləndirilir. Bu zaman aşağıdakılar təhlil olunur:

- tədris planlarının baza təhsil proqramlarına uyğun hazırlanması və təsdiqi;
- tədris planlarında olan fənlərin və onların proqramlarının məzmununun dövlət təhsil standartlarının tələblərinə uyğunluğu;
- tədris olunan fənlərə ayrılmış saatların miqdarının tədris planlarına uyğunluğu;
- tədris planlarında nəzərdə tutulmuş fənlərə dair tədris-informasiya mənbələrinin kifayət qədər olub-olmaması və müasirliyi. Bu məqsədlə aşağıdakılar müəyyən olunmalıdır:
- fənn proqramlarında tövsiyə olunan tədris-metodik vəsaitlər və onların nüsxələrinin mövcud normalara uyğun kitabxana fondunda olması;
- tədris planında nəzərdə tutulmuş fənlər üzrə proqram təminatı;
- təhsil müəssisəsinin beynəlxalq informasiya şəbəkəsinə çıxışı;
- son beş ildə təhsil müəssisəsinin hazırladığı tədris-metodik materiallar, o cümlədən Azərbaycan Respublikası Təhsil Nazirliyinin təsdiq etdiyi dərsliklər və dərs vəsaitləri;
- təhsilalanların kurs işləri, təcrübələrin (istehsalat və pedaqoji) aparılmasına dair sənədlər, məzunların buraxılış işlərinin və dövlət imtahanlarının (buraxılış imtahanlarının) nəticələri.

Təhsil proqramları üzrə hazırlığın məzmununu təhsil müəssisəsi aşağıdakı kimi qiymətləndirir:

- uyğundur;
- əsasən uyğundur;
- uyğun deyildir.

Qiymətləndirmə təsdiqedici sənədlərlə əsaslandırılmalıdır.

Təhsil proqramları üzrə hazırlığının strukturunun təhlili təhsil müəssisəsinin gələcək inkişaf perspektivlərini müəyyənləşdirmək məqsədi ilə aparılır.

Təhlil təhsil müəssisəsinin cari tədris ilinin oktyabr ayının 1-nə olan məlumatları əsasında aparılır. Bu zaman aşağıdakılar müəyyən edilməlidir:

- son beş il ərzində mütəxəssis hazırlığının strukturunda aparılmış dəyişikliklər və onların təhsil müəssisəsinin profilinə və əmək bazarının tələbatına uyğunluğu;
- son beş il ərzində təhsil müəssisəsini bitirənlərin (dövlət hesabına və ödənişli əsaslarla) nəticələrinin təhlili.

3.3.4. Tədris prosesinin təşkilinin qiymətləndirilməsi

Tədris prosesinin təşkilinin qiymətləndirilməsi üçün aşağıdakılar müəyyən edilməlidir:

- tədris prosesinin təşkilinin tədris planlarına uyğunluğu;
- təhsilalanların fəallığını artıran yeni təlim, texnologiya və metodların tətbiqi;
- təhsilalanların elmi-tədqiqat işlərinin təşkili;
- tədris-laboratoriya bazasının mövcud tələblərə uyğunluğu;
- tədris prossesində yeni informasiya texnologiyalarının və hesablama texnikasının tətbiqi.

3.3.5. Təhsil proqramları üzrə hazırlığın keyfiyyəti

Təhsil proqramları üzrə hazırlığın keyfiyyəti ayrı-ayrı proqramlar üzrə təhsilalanların imtahanlarının, buraxılış işlərinin, dövlət və ya buraxılış imtahanlarının, eləcə də özünütəhlil zamanı təhsilalanların attestasiyasının nəticələrinin təhlili əsasında müəyyən edilir. Bu zaman ayrı-ayrı təhsil proqramlarının, kadr təminatının, maddi-texniki bazanın, beynəlxalq əməkdaşlığın, sosial-məişət şəraitinin təhlili də verilməlidir.



(Davamı 2-ci səhifədə)

# Elmi Şuranın iclasında

(Əvvəli 1-ci səhifədə)

Təhsilalanların müvafiq proqramları mənimsəmə səviyyəsi və təhsil proqramları üzrə hazırlığının keyfiyyəti aşağıdakılarla müəyyənləşdirilir:

- təhsilalanların imtahanlarının nəticələri;
- təhsil müəssisəsinin keçirdiyi monitorinqin nəticələri (buraxılış qruplarında və ya siniflərində təhsilalanların bilik səviyyəsi təhsil müəssisəsində hazırlanmış suallar əsasında müəyyənləşdirilir və qiymətləndirilir);
- məzunların buraxılış işlərinin, dövlət və ya buraxılış imtahanlarının nəticələri (buraxılış işlərinin mövzularının təhlili, onların məzmununun təhsil proqramlarının profilinə uyğunluğu, dövlət və ya buraxılış imtahanlarının təşkili və keçirilməsi);
- attestasiya komissiyası sədrlərinin verdikləri hesabatların təhlilinin nəticələri;
- təhsil proqramları üzrə aparılan hazırlığa dair şikayətlərin (təhsilalanların, idarə və təşkilatların və sair) olub-olmaması.

Ayrı-ayrı təhsil proqramları üzrə hazırlığın keyfiyyəti və təhsilalanların mənimsəmə səviyyəsi aşağıdakı kimi qiymətləndirilir:

- yoxlama zamanı təhsilalanların 91-100 faizi müsbət qiymət aldıqda - əla; - 71-90 faizi müsbət qiymət aldıqda - yaxşı, - 51-70 faizi müsbət qiymət aldıqda - kafi, - 50 faizdən az (50 faiz də daxil olmaqla) hissəsi müsbət qiymət aldıqda - qeyri- kafi.

Yoxlama zamanı sorğu aparılacaq tədris qruplarında təhsilalanların 90 faizinin iştirakı vacibdir.

Özünütəhlil zamanı yoxlama üçün istifadə olunmuş suallar hesabatla birlikdə Azərbaycan Respublikasının Təhsil Nazirliyinə təqdim edilir.

3.3.11. Özünütəhlil hesabatına əvvəlki akkreditasiya zamanı aşkar olunmuş çatışmazlıqların aradan qaldırılması barədə məlumatlar əlavə olunur.

***

Professor M.Cəbrayılov attestasiya və akkreditasiya işində təhsil müəssisəsinin idarə olunması, mütəxəssis hazırlığının məzmunu, strukturu, keyfiyyəti, kadr təminatı, beynəlxalq əməkdaşlığı, elmi-tədqiqat fəaliyyəti, maddi-texniki bazası, sosial-məişət şəraiti, maliyyə təminatı, bütövlükdə və ayrı-ayrı təhsil proqramları üzrə hazırlığın məzmununun, struktur və keyfiyyətinin təhlil edilərək qiymətləndirilməsinin, həmçinin tələbələrin biliyinin qiymətləndirilməsi kimi məsələlərin öndə olduğunu söyləmişdir. Professor M.Cəbrayılovun çıxışından məlum olmuşdur ki, təhsilalanların biliyinin ayrı-ayrı təhsil proqramları üzrə attestasiyası Təhsil Nazirliyi tərəfindən hazırlanan yoxlama tapşırıqları əsasında Akkreditasiya Komissiyası tərəfindən yazılı formada keçirilir. Həmin tapşırıqlar təhsil müəssisəsinin təqdim etdiyi müvafiq fənn proqramlarına uyğun şəkildə hazırlanmış suallar üzrə tərtib olunur. Təhsilalanların müvafiq proqram üzrə bilik səviyyəsi bu tapşırıqlar əsasında müəyyənləşdirilir. Tapşırıqlar 6 fənni əhatə etməklə, yaddaş biliyinin müəyyənləşdirilməsi prinsipi əsasında hazırlanmış 60 sualdan, ali təhsil pilləsinin magistratura səviyyəsində isə 4 fənni əhatə etməklə 40 sualdan ibarət olur. Suallara düzgün cavabların sayı 50 faizdən az (50 faiz də daxil olmaqla) olduqda, təhsilalanların mənimsəmə səviyyəsi "qeyri-kafi", 51-70 faiz olduqda "kafi", 71-90 faiz olduqda "yaxşı", 91-100 faiz olduqda "əla" qiymətləndirilir.

Yoxlamanın aparılmasına 2 akademik saat vaxt ayrılır. Yoxlama işləri şifrələnir və müvafiq fənlər üzrə Akkreditasiya Komissiyasının üzvləri tərəfindən qiymətləndirilir.

Bu məsələlərə aydınlıq gətirən professor M.Cəbrayılov adıçəkilən sənədlərin oktyabr ayının sonuna qədər təhvil verilməsinin vacibliyini qeyd etmişdir.

***

2014-2015-ci tədris ili üçün bakalavr və magistr pillələrinə qəbulun nəticələri haqqında məsul katibin müavini, professor İbrahim Bayramov məlumat vermişdir. Professor İ.Bayramovun verdiyi məlumata görə, 21 ixtisas üzrə bakalavr pilləsinə qəbul olunan 1989 nəfər tələbədən 1832 nəfəri Azərbaycan bölməsinin əyani şöbəsinə (dövlət hesabına 994, ödənişli 838), 50 nəfəri rus bölməsinin əyani şöbəsinə (dövlət hesabına 17, ödənişli 33), 107 nəfəri qiyabi şöbəyə (onlardan 27 nəfəri dövlət hesabına, 80 nəfəri isə ödənişli) qəbul edilmişdir.

Magistr pilləsində isə bu dərs ilində 26 ixtisas üzrə 342 nəfər (187 nəfər dövlət hesabına, 155 nəfər ödənişli) təhsil alacaqdır.

***

"ADPU.EDU.AZ" portalının rəhbəri Etibar Axundov universitet portalının fəaliyyəti ilə Elmi Şura üzvlərini məlumatlandırdı. Bildirdi ki, portal 2013-cü ilin iyun ayından fəaliyyət göstərir. Orta hesabla gün ərzində təqribən 800-1000 nəfər portaldan bəhrələnir.

E.Axundov portalın istismarının I mərhələsində ADPU-nun tədris və qeyri-tədris strukturları üzrə statik informasiya - PASPORT verilənlər portala yerləşdirildiyini, 2014-2015-ci tədris ilindən isə portalın istismarının II mərhələsinin yerinə yetirilməyə başlandığını söylədi. Onun çıxışından məlum oldu ki, II mərhələdə portala Fənn Tədris Proqramları (FTP) üzrə dərslərin (mühazirə-seminar-laboratoriya) elektron variantları yerləşdiriləcək. Bu mərhələdə əsasən tədris strukturlarının (Fakültə-kafedra) mövzular üzrə dərslərinin (mühazirə-seminar-laboratoriya) və test tapşırıqlarının yerləşdirilməsi nəzərdə tutulur. Elektron mühazirələr şablon əsasında hazırlanacaq. Bununla yanaşı, PASPORT verilənlərin həm tədris, həm də qeyri-tədris strukturları üzrə yenilənməsi, dəqiqləşdirilməsi prosesi davam etdiriləcək. Məlumat üçün bildirək ki, artıq "ADPU.EDU.AZ" portalının (VTS-TSW 5.x.x platforması) və VTS-TEST sisteminin istismarı üzrə seminarlar keçirilməyə başlanmışdır.

**A.İSGƏNDƏROV**

# Akademik Ramiz Mehdiyevin "Şah İsmayıl Səfəvi: hökmdarın və döyüşçünün portreti" kitabı çapdan çıxıb

Akademik Ramiz Mehdiyevin "Şah İsmayıl Səfəvi: hökmdarın və döyüşçünün portreti" kitabının birinci hissəsi yenicə çapdan çıxıb.

Bu əsər görkəmli dövlət xadimi və sərkərdə, Azərbaycan tarixində ilk mərkəzləşdirilmiş dövlətin - Səfəvilər dövlətinin banisi Şah İsmayıl Səfəvinin (1487-1524) hərbi-siyasi, ideoloji və diplomatik irsinə milli tarix elmimizdə ən bitkin və sistemli baxışın məhsuludur.

Kitabın "Müəllifdən" bölməsində deyildiyi kimi, bu gün müstəqillik yolu ilə uğurla irəliləyən Azərbaycanın obyektiv tarixinin bərpa edilməsi, habelə xalqımızın görkəmli şəxsiyyətlərinə yenidən qiymət verilməsi məsələsi tarix elmimizin qarşısında duran ən mühüm vəzifələrdən biridir.



Akademik Ramiz Mehdiyev öz kitabında yazır: "Azərbaycan bəşəriyyətin siyasi tarixinə, dünya mədəniyyət xəzinəsinə böyük töhfələr vermiş görkəmli şəxsiyyətləri ilə haqlı olaraq fəxr edə bilər. Tarixin ən mürəkkəb və ümidsiz dövrlərində də bu xalqın arasından öz iradi keyfiyyətləri və istedadları sayəsində, bəzən həyatları bahasına, amansız təhdid və təhlükələrə məhəl qoymadan tarixin gedişini öz xalqının xeyrinə dəyişmiş böyük siyasi xadimlər, cəsur qəhrəmanlar, görkəmli alim və mütəfəkkirlər çıxıb".

Akademikin fikrincə, sözsüz ki, Şah İsmayıl Səfəvi Azərbaycan tarixinin məhz bu cür parlaq, əlinə qılınc götürərək doğma xalqının taleyini dəyişmiş, onu pərakəndəlikdən, öz dövrünün ən böyük imperiyalarından birinin titul milləti səviyyəsinə çatdırmış simalardan biridir.

Müəllif əsəri iki hissəyə bölüb. Birinci hissədə Səfəvilər sülaləsinin etnik mənşəyi və eyniadlı sufi ordeninin yaranmasından mərkəzləşdirilmiş dövlətin təşəkkülünə qədər olan dövrdə tarixi məsələləri, Şah İsmayılın və onun əcdadlarının şanlı həyat yolu, bu sülalənin Azərbaycan torpaqlarının birləşdirilməsi uğrunda mübarizəsi, habelə Səfəvilər dövlətinin siyasi sistemi və dini siyasəti nəzərdən keçirilir. Əsərdə Səfəvilər dövlətinin banisinin dövründə bu məmləkətin mədəniyyətinə də xeyli yer ayrılıb, görkəmli hökmdarın Azərbaycan mədəniyyətinin və dilinin inkişafında xidmətləri sadalanıb.

Kitabın ikinci hissəsi Şah İsmayıl Səfəvinin müzəffər yürüşlərinə və diplomatik fəaliyyətinə, Şeybanilər və Osmanlı dövlətləri ilə müharibələrinə həsr edilib.

Müəllif bu kitabı yazarkən həm Azərbaycan, həm də xarici səfəvişünaslığın əsas nailiyyətlərini nəzərə alıb. Eyni zamanda kitabda ilk dəfə olaraq, dünyanın görkəmli şərqşünaslarının araşdırmalarında əksini tapmamış məxəzlərdən istifadə edilib. Buna kitabın sonunda göstərilən istifadə olunmuş ədəbiyyat siyahısı dəlalət edir.

Akademik Ramiz Mehdiyevin bu əsəri yeddi fəsildən ibarətdir. Müəllifin toxunduğu məsələlərin vacibliyi və əhatə dairəsi barədə tam təsəvvür yaranması üçün həmin fəsillərin adlarını sadalamaq kifayətdir: "Qərəzsiz və nifrətsiz", "Səfəvilər sülaləsinin etnik mənsubiyyəti", "Səfəviyyə" ordenin yaranması və siyasiləşməsi", "Səfəvilərin ideologiyası. Şiəlik və qızılbaşlıq siyasi mübarizə vasitələri kimi", "İsmayıl tərəfindən Azərbaycan torpaqlarının birləşdirilməsi və Səfəvilər dövlətinin yaranması", "Şah İsmayılın böyük dövləti: hərbi və siyasi sistemə baxış", "Şah İsmayıl Səfəvi və Azərbaycan mədəniyyətinin və dilinin çiçəklənməsi".

"Şah İsmayıl Səfəvi: hökmdarın və döyüşçünün portreti" kitabında İsmayıl Səfəvinin dövründə (1501-1524-cü illər) Səfəvilər dövlətinin Azərbaycan tarixi atlasından götürülmüş, həmin dövlətin miqyası barədə tam təsəvvür yaradan xəritəsinə və müvafiq illüstrasiyalara da yer ayrılıb.

"Şərq-Qərb" nəşriyyat evində çapdan çıxmış bu kitab mütəxəssislər - tarixçilər və şərqşünaslar, habelə Azərbaycan tarixinin həmin dövrü və Şah İsmayıl Səfəvinin siyasi irsi ilə maraqlanan oxucular üçün nəzərdə tutulub.

**AzərTAc**

# Kimya fakültəsində 5 oktyabr-Beynəlxalq Müəllimlər Günü qeyd edilib

Oktyabr ayının 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Kimya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə 5 oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir keçirildi.



ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev tədbiri giriş sözü ilə açaraq müəllim və tələbələrə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun 5 oktyabr-Beynəlxalq Müəllimlər Günü münasibətilə təbriklərini çatdırdı və onlara həyatda, təhsildə uğurlar arzuladı.

Kimya fakültəsinin dekanı, dosent Vaqif Həsənov tədbirdə çıxış edərək toplantı iştirakçılarını bu xoş və əlamətdar gün münasibətilə təbrik etdi və onlara uğurlar arzuladı. Dosent V.Həsənov ümummilli lider Heydər Əliyevin həmişə müəllim peşəsinə yüksək qiymət verdiyini bildirdi və Ulu Öndərin ADPİ-nin (indiki ADPU) 60 illik yubileyində ali məktəb müəllimlərinə verdiyi yüksək qiyməti xatırlatdı.

Dosent V.Həsənov çıxışına davam edərək bildirdi ki, ulu öndər Heydər Əliyevin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev elm və təhsilə, o cümlədən müəllim əməyinə, pedaqoji fəaliyyətə yüksək qiymət verir. Eyni zamanda Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva təhsil sahəsinə xüsusi qayğı və diqqət göstərir.

Dosent V.Həsənov qeyd etdi ki, Təhsil Naziri cənab Mikayıl Cabbarov "Pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinin müəllimlik ixtisaslarına yüksək balla qəbul olunmuş tələbələr üçün Təhsil Nazirliyinin məqsədli təqaüdünün təsis edilməsi barədə" əmr imzalayıb. Həmin əmrə əsasən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. "Gələcəyin müəllimi təqaüdü"nün təsis edilməsi "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na uyğun olaraq peşəkar bilik və kompetensiyalara malik pedaqoji kadrların hazırlanmasına xidmət edir. Cənab nazirin bu əmrinə uyğun olaraq Azərbaycanda pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən 300 tələbə 100 manat təqaüd alacaqdır.

Dosent V.Həsənov eyni zamanda Təhsil Nazirliyi tərəfindən tələbələrə daha yüksək bilik vermək məqsədilə "SABAH" qruplarının təşkil edildiyini və builki tədris ilində fakültənin kimya



müəllimliyi ixtisasından Gülnarə Qurbanovanın da bu qrupda oxuduğunu qeyd etdi. O, çıxışının sonunda tələbə-gənclərə daha yaxşı oxumağı və daxili nizam-intizam qaydalarına riayət etməyi tövsiyə etdi.

Sonra fakültə tələbələrinin hazırladıqları bədii hissə nümayiş etdirildi.

**Ədilə MAHMUDOVA,**
**Kimya fakültəsinin**
**dekan müavini, dosent**

# Müəllimlik ixtisaslarına yüksək balla qəbul olunmuş tələbələr üçün təqaüd təsis edilib

Təhsil Naziri Mikayıl Cabbarov "Pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinin müəllimlik ixtisaslarına yüksək balla qəbul olunmuş tələbələr üçün Təhsil Nazirliyinin məqsədli təqaüdünün təsis edilməsi barədə" əmr imzalayıb.

"Gələcəyin müəllimi təqaüdü"-nün təsis edilməsi "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na uyğun olaraq peşəkar bilik və kompetensiyalara malik pedaqoji kadrların hazırlanmasına xidmət edir.

Təqaüd 100 manat məbləğində olmaqla Azərbaycanda pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən 300 tələbəyə şamil olunur.

# Müəllim

*5 oktyabr- Beynəlxalq Müəllimlər Günü münasibəti ilə bütün müəllimlərə həsr edirəm*

Çəkib üstümüzdə xeyli zəhməti,
Müqəddəs sayılır onun sənəti.
Unutmaq olarmı o şəxsiyyəti?!
Bizə bilik verən əziz müəllim.

Həvəslə öyrətdin bizlərə savad,
Dedin ki,bilikdir insana qanad.
Borcluyam etməyə sizləri mən yad
Bizə bilik verən əziz müəllim.

Müəllim, sanki bir valideyn kimi
Hər bir çətin yolda tutdun əlimi,
Tanrı hifz eləsin müəllimimi,
Bizə bilik verən əziz müəllim.

Müəllim işıqdır, işıq var olsun!
Nadan insanlara dünya dar olsun!
O hər bir cəhətdən bəxtiyar olsun!
Bizə bilik verən əziz müəllim.

**Şəhriyar BƏHMƏNOV,**
**Filologiya fakültəsinin**
**III kursunun 301-ci qrup**
**tələbəsi.**

# Tarix fakültəsində 5 oktyabr - Beynəlxalq Müəllimlər Günü qeyd edilib

Oktyabr ayının 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Tarix fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə 5 oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir keçirilib.

Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib. Toplantıda çıxış edən Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanov bu xoş və əlamətdar gün münasibətilə professor-müəllim heyətini və tələbələri təbrik edib, onlara uğurlar arzulayıb. Professor Oqtay Sultanov Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ölkəmizdə elm və təhsilin inkişafına, onun maddi-texniki bazasının gücləndirilməsinə göstərdiyi yüksək qayğı və diqqətdən, eyni zamanda milli təhsil sistemimizdə əldə olunan böyük uğur və nailiyyətlərdən danışıb.




Professor O.Sultanov öz çıxışında bildirib ki, 5 oktyabr-Beynəlxalq Müəllimlər Gününün qeyd edilməsi ilə bağlı qərar 1966-cı il oktyabrın 5-də BMT-nin ali mədəniyyət qurumu olan UNESKO tərəfindən verilmişdir. Həmin ildən başlayaraq hər il oktyabrın 5-də dünyada Beynəlxalq Müəllimlər Günü qeyd edilir. Ulu öndər Heydər Əliyev 1993-cü ildə Azərbaycanda yenidən hakimiyyətə qayıtdıqdan sonra bu bayram keçirilməyə başlanıb. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir və ölkəmizdə pedaqoji fəaliyyətin stimullaşdırılması üçün bütün tədbirləri həyata keçirir.



Tədbirdə tələbələr tərəfindən Tarix fakültəsinin dekanı, professor O.Sultanova onlara göstərdiyi qayğı və diqqətə görə "Qayğıkeş müəllim" mükafatı verildi, müəllimlərə qızıl güllər paylanıldı, həmçinin fakültənin tarixini əks etdirən videoçarx nümayiş olundu.

Tədbir Tarix fakültəsi tələbələrinin hazırladıqları konsert proqramı ilə başa çatdı.

**Gülnar SÜLEYMANOVA,**
**Mətbuat və informasiya şöbəsinin əməkdaşı**

# İstiqlal mübarizəmizin şərəfli səhifəsi

***ADPU-da 18 oktyabr-Azərbaycanın dövlət müstəqilliyinin bərpa edilməsinin 23-cü ildönümünə həsr edilmiş tədbir keçirilib***

Oktyabr ayının 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda 18 oktyabr-Azərbaycanın dövlət müstəqilliyinin bərpa edilməsinin 23-cü ildönümünə həsr edilmiş dəyirmi masa keçirilib. Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib.

Professor-müəllim heyətinin və tələbə-gənclərin iştirak etdiyi tədbiri ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açaraq müəllim və tələbələri Azərbaycanın dövlət müstəqilliyinin bərpa edilməsinin 23-cü ildönümü münasibətilə təbrik edib, onlara həyatda, elm və təhsildə uğurlar arzulayıb.

Professor R.Baxşəliyev çıxışına davam edərək bildirib ki, 1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Xalq Cümhuriyyəti dövründə əldə etdiyimiz müstəqillik daxili çəkişmələr, xarici hərbi müdaxilə və beynəlxalq siyasi dəstəyin olmaması səbəbindən əlimizdən alınmışdır. Lakin azadlıq və istiqlal duyğusu, milli dövlətçilik ideyası həmişə xalqımızın ürəyində, şüurunda, beynində yaşamışdır.

Keçən əsrin 80-ci illərinin sonları, 90-cı illərinin əvvəllərində xalqımız yenidən öz istiqlalı uğrunda mübarizəyə qalxdı. Əvvəlcə 1991-ci il avqustun 30-da parlamentdə «Azərbaycan Respublikasının dövlət suverenliyi haqqında Bəyannamə» qəbul edildi, bir qədər sonra isə, yəni 1991-ci il oktyabrın 18-də «Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı» qəbul edildi.

Dövlət müstəqilliyini elan etmiş Azərbaycan çox çətin, mürəkkəb və ziddiyyətli tarixi-siyasi şəraitdə fəaliyyət göstərirdi. Ağır və çətin olsa da, Azərbaycanın dövlət müstəqilliyini dünya dövlətləri tanımağa başladı. Azərbaycanın müstəqilliyini ilk olaraq 1991-ci il noyabr ayının 9-da Türkiyə, 1991-ci il dekabr ayının 11-də Rumıniya, 1991-ci il dekabr ayının 13-də Pakistan, 1991-ci il dekabr ayının 23-də İsveçrə, 1991-ci il dekabr ayının 25-də İran, 1992-ci il yanvar ayının 23-də ABŞ, 1992-ci il aprel ayının 10-da isə Rusiya tanıdı. Ölkəmiz 1992-ci il mart ayının 2-də BMT-yə üzv qəbul edildi. 1991-1992-ci illərdə isə Azərbaycan bir çox beynəlxalq təşkilatlara, o cümlədən İslam Konfransı Təşkilatına, İqtisadi Əməkdaşlıq Təşkilatına, Avropada Təhlükəsizlik və Əməkdaşlıq Təşkilatına, Qara Dəniz İqtisadi Əməkdaşlıq Birliyinə daxil olmuşdur.

Əslində, «Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı» ilkin mərhələdə yalnız quru kağız olaraq qalırdı. Yəni həmin dövrdə Azərbaycanın müstəqilliyi formal, nominal xarakter daşıyırdı. Azərbaycanın hər tərəfindən baş qaldıran separatçılıq meylləri müstəqil dövlətimiz üçün ciddi təhlükə mənbəyi idi. Elə buna görə də 1991-1993-cü illər xalqımızın müstəqillik tarixində nəinki itirilmiş illər, hətta müstəqilliyimiz üçün təhlükə törədən bir çox zərərli meyl və təzahürlərin yarandığı bir dövr kimi səciyyələndirilə bilər. Yalnız ulu öndərimiz Heydər Əliyev 1993-cü ilin iyununda xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə yenidən respublikamızda hakimiyyətə qayıtdıqdan sonra öz böyük siyasi uzaqgörənliyi, zəngin idarəçilik və dövlətçilik təcrübəsi sayəsində ölkəmizin formal, nominal müstəqilliyinin həqiqi müstəqilliyə, faktiki müstəqilliyə çevrilməsini təmin etdi, ölkədə müasir dünyamızın reallıqlarını nəzərə alan yeni siyasi kurs formalaşdı.

Böyük qürur hissi ilə deyə bilərik ki, ulu öndərimiz Heydər Əliyevin elmi əsaslara söykənən müdrik siyasi kursunu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev həyatımızın bütün sahələrinin, xüsusilə də, iqtisadiyyatın dinamik inkişafını təmin etmişdir.

Professor R.Baxşəliyev çıxışının sonunda bir daha tədbir iştirakçılarını Azərbaycanın dövlət müstəqilliyinin bərpasının 23-cü ildönümü münasibətilə təbrik etdi və onlara ən xoş arzularını bildirdi.

Tədbirdə "Azərbaycanın dövlət müstəqilliyinin bərpasının 23-cü ildönümü" mövzusunda məruzə ilə çıxış edən Azərbaycan tarixi kafedrasının professoru, Əməkdar müəllim Xəlil Köçərli yaxın tarixi keçmişimizə nəzər salaraq həmin



dövrün tarixi-siyasi şəraitini konkret faktlar əsasında ətraflı təhlil etdi. Professor Xəlil Köçərli öz geniş məzmunlu məruzəsində bildirdi ki, XX əsr xalqımızın, millətimizin tarixində xüsusi yer tutur. Sovetlər Birliyinin süqutu və Dağlıq Qarabağ münaqişəsi ilə əlaqədar başlayan və zaman-zaman genişlənən milli-azadlıq hərəkatı müstəqil dövlətimizin yaranmasında böyük rol oynadı. Qeyd edək ki, xalqımızın bu mücadiləsi böyük qurbanlarla, faciələrlə üzləşməli olurdu. Mərkəzi hakimiyyətin imperiyanı qoruyub saxlamaq iddialarından əl çəkmək istəməməsi xalqımızın azadlıq mübarizəsinə başlıca əngəl idi. Azərbaycana qarşı əsassız ərazi iddiaları işə salınmışdı. Digər tərəfdən, 1988-ci ilin dekabr ayında əzəli Türk torpaqları sayılan Qərbi Azərbaycandan 250



mindən çox soydaşımızın öz tarixi ata-baba yurdlarından deportasiya edilməsi də xalqımızın milli-azadlıq mücadiləsinin qarşısını almaq məqsədini güdürdü. Azərbaycanlılar eyni zamanda Dağlıq Qarabağda da zorla öz doğma yurdlarından didərgin salınır, qətlə yetirilir, onların əmlakı talan edilirdi. Bir sözlə, mərkəzi hakimiyyət ermənilərin əli ilə xalqımıza qarşı olmazın cinayətlər törədirdi. Xalqımız əslində faktiki olaraq təklənilmiş vəziyyətə salınmışdı. Buna cavab olaraq, xalqımız küçə və meydanlara axışaraq, tapdalanmış hüquqlarının bərpasını tələb etdi. Lakin xalqımız tamamilə başqa bir faciəli hadisə ilə üzləşməli oldu: 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə Bakıda qanlı 20 Yanvar faciəsi törədildi. Bu qətliamın törədilməsində də başlıca məqsəd yenə də xalqımızın azadlıq ruhunu öldürmək idi. Lakin bütün baş verən bu haqsızlıqlara, faciələrə baxmayaraq, xalqımız öz müstəqilliyinə doğru addım-addım irəlliləməkdə davam edirdi. Beləliklə, 1991-ci il avqustun 30-da parlamentdə «Azərbaycan Respublikasının dövlət suverenliyi haqqında Bəyannamə» qəbul edildi, 1991-ci il oktyabrın 18-də isə «Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı» qəbul edildi. Bu Aktın qəbul edilməsi mühüm tarixi-siyasi hadisə idi və həmin gün tariximizə dövlət müstəqilliymizin bərpası günü kimi daxil oldu. Bu mühüm tarixi sənədin qəbul edilməsi ilə xalqımız uzun illərdən bəri arzusunda olduğu azadlığına qovuşdu. Yeni yaranan müstəqil Azərbaycan dövləti özünün Azərbaycan Xalq Cümhuriyyətinin siyasi varisi olduğunu bəyan edərək onun bayrağını, gerbini, himnini dövlət atributları kimi qəbul etdi.

Lakin həmin dövrdə respublikamıza rəhbərlik edən şəxslərin siyasi səriştəsizliyi, milli maraq və mənafelərdən çox uzaqda dayanmaları, bəzi hallarda isə hətta bu maraqlara xəyanət etmələri Azərbaycanın əsl müstəqil dövlət kimi yaşamasına imkan vermirdi. Dahi öndərimiz Heydər Əliyevin belə bir müdrik kəlamı var: «Azərbaycanın dövlət müstəqilliyi Azərbaycan xalqının milli sərvətidir». Eyni zamanda Ulu Öndərimiz müstəqilliyin qorunmasının vacibliyini də ön plana çəkərək demişdir: «Müstəqilliyin qorunması onun əldə edilməsindən qat-qat ağır və mürəkkəb vəzifədir». Azərbaycanın 1991-1993-cü illərdə yaşadığı ağır və üzücü ictimai-siyasi proseslər Ümummilli Liderimizin bu kəlamını bir daha təsdiqləyir. Məhz xalqımızın böyük oğlu, müdrik və mahir siyasətçi Heydər Əliyev öz zəngin təcrübəsi, yenilməz iradəsi hesabına Azərbaycanda möhkəm və dönməz daxili ictimai-siyasi sabitliyi təmin etdi. Dahi rəhbərimiz Azərbaycanın dövlət müstəqilliyini qoruyub saxladı, ölkəmizin beynəlxalq arenaya çıxışını təmin etdi. Ulu Öndərimizin rəhbərliyi altında ölkəmizdə hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu prosesi başlandı. 1994-cü il sentyabr ayının 20-də Bakıda Azərbaycana böyük iqtisadi və siyasi dividentlər gətirən, ölkəmizin enerji təhlükəsizliyini təmin edən «Əsrin müqaviləsi» imzalandı. 1994-cü ilin oktyabr və 1995-ci iln mart dövlət çevrilişlərinə cəhd cinayətlərinin qarşısı qətiyyətlə alındı. 1995-ci il noyabr ayının 12-də müəllifi ulu öndərimiz Heydər Əliyev olan Azərbaycanın ilk milli Konstitusiyası qəbul edildi. Azərbaycan 1995-ci ildə Helsinki Yekun Aktına qoşuldu. 2001-ci il yanvar ayının 25-də isə ölkəmiz Avropa Şurası kimi nüfuzlu və mötəbər bir beynəlxalq quruma tamhüquqlu üzv oldu.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müstəqil ölkəmizi sürətlə inkişaf etdirir, onun daha da güclənməsi üçün məqsədyönlü səmərəli əməli fəaliyyət həyata keçirir. Həyata keçirilən uğurlu sosial-iqtisadi siyasət nəticəsində təkcə bu ilin 9 ayı ərzində ölkəmizdə ümumi daxili məhsul və qeyri-neft sektoru 6% artmışdır. Bu dövr ərzində əhalinin pul gəlirləri 5,4% artmış, inflasiya isə cəmi 1,5% olmuşdur. 9 ayda Azərbaycan iqtisadiyyatına 19 milyard dollar sərmayə qoyulmuşdur ki, bunun 11 milyardı daxili sərmayədir. İlin əvvəlindən ölkəmizin maliyyə resursları 3 milyard 600 milyon dollar artmışdır. Azərbaycanın hazırda 53 milyard dollardan çox valyuta ehtiyatları var. 9 ayda ölkəmizdə 100 mindən çox yeni iş yeri açılıb ki, onların da 80 mini daimi iş yeridir. Bütövlükdə isə son 10 ildə Azərbaycanda 1 milyon 300 min yeni iş yeri açılmışdır ki, bunun da nəticəsində Azərbaycanda işsizlik 5%-ə enmişdir. Azərbaycan rəqabətədavamlılığa görə hazırda dünyada 38-ci yerdədir.

Bu il sentyabr ayının 20-də Bakıda "Cənub" qaz dəhlizinin təməlqoyma mərasiminin keçirilməsi də böyük beynəlxalq hadisədir. Cənab Prezidentin qeyd etdiyi kimi, əgər "Əsrin müqaviləsi" XX əsrin müqaviləsi idisə, "Cənub" qaz dəhlizi XXI əsrin layihəsidir. Bu layihə də öz növbəsində Azərbaycana böyük iqtisadi imkanlar açacaqdır.

Azərbaycan son illər beynəlxalq siyasi münasibətlər sistemində də öz layiqli yerini tutmuşdur. Belə ki, Azərbaycan 2011-ci il oktyabr ayının 24-də 155 ölkənin yüksək etimadı və böyük siyasi dəstəyi ilə dünyanın ən nüfuzlu və mötəbər beynəlxalq qurumu olan Birləşmiş Millətlər Təşkilatının (BMT) Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilmişdir. 2012-ci ilin may ayında isə ölkəmiz BMT Təhlükəsizlik Şurasına sədrlik edərək beynəlxalq təhlükəsizlik problemləri ilə bağlı uğurla fəaliyyət göstərdi. Ötən il oktyabr ayının 1-dən Azərbaycan yenidən BMT Təhlükəsizlik Şurasına sədrlik etməyə başladı və dünyada ədalətin, sülhün, əmin-amanlığın təmin edilməsi istiqamətində uğurla fəaliyyət göstərdi. Həmçinin beynəlxalq siyasi nüfuzu artan Azərbaycan bu ilin may ayında Avropa Şurasının Nazirlər Komitəsinə sədrlik etdi. Bu isə öz növbəsində Azərbaycan həqiqətlərinin, xüsusilə də, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün əlverişli şərait yaratdı.

Son illər Azərbaycan möhtəşəm beynəlxalq tədbirlərin, sivilizasiyalararası dialoqların keçirildiyi bir məkana çevrilmişdir. Bu baxımdan, oktyabrın 2-3-də Heydər Əliyev Mərkəzində keçirilən IV Bakı Beynəlxalq Humanitar Forumunu xüsusi qeyd edə bilərik. Dünya miqyaslı bu Forumda 60 ölkədən 500-ə yaxın qonaq, o cümlədən müxtəlif sahələr üzrə Nobel mükafatına layiq görülmüş 10-dan çox tanınmış və nüfuzlu şəxs iştirak edirdi. Azərbaycan multikulturializm baxımından bütün dünya üçün layiqli bir örnəkdir. Ölkəmiz sözün həqiqi mənasında möhtəşəm beynəlxalq tədbirlərin reallaşması üçün ideal bir məkana çevrilmişdir.

Məlum olduğu kimi, 2013-cü il oktyabr ayının 9-da ölkəmizdə növbəti Prezident seçkiləri keçirildi. Bütün dünya ictimaiyyətinin, beynəlxalq təşkilatların diqqətlə izlədiyi, 40 mindən çox müşahidəçinin, o cümlədən 1400-ə yaxın beynəlxalq müşahidəçinin izlədiyi Prezident seçkilərində cənab İlham Əliyev öz rəqiblərini böyük səs çoxluğu ilə geridə qoyaraq xalqımızın böyük dəstəyi və etimadı ilə yenidən Azərbaycan Respublikasının Prezidenti seçildi. Cənab İlham Əliyev Prezident seçkilərində inamlı və möhtəşəm qələbə qazandı. Tam azad, ədalətli, şəffaf və demokratik keçirilən seçkilərdə xalqımız öz siyasi iradəsini ortaya qoyaraq cənab İlham Əliyevin nəhəng idarəçilik və dövlətçilik fəaliyyətinə yenidən yüksək qiymət verdi. Sonuncu Prezident seçkilərindən ötən 1 il ərzində də Azərbaycan bütün sahələrdə böyük uğurlara imza atdı.

Dəyimi masada çıxış edən I kurs magistrantı Murad Əliyev 1991-ci ilin 18 oktyabrının xalqımızın istiqlal mübarizəsi tarixində şərəfli bir səhifə olduğunu xüsusi qeyd etmiş və bugünkü müstəqil, hüquqi, demokratik, dünyəvi Azərbaycan dövlətinin böyük uğurlar qazanmasından danışmışdır. O, həm də öz çıxışında tələbəgəncləri Azərbaycan Prezidenti cənab İlham Əiyevin ətrafında sıx birləşməyə və ölkəmizin daha da qüdrətlənməsinə layiqli töhfələr verməyə çağırmışdır.

Tədbir çıxış və müzakirələrlə başa çatmışdır.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

***”...O, gözəl, girdəsifət gənc bir qızdı; şərqli qızlara məxsus qara, dərin, atəşli gözləri, qələmlə çəkilmiş kimi qaşları, incə dodaqları vardı...”***

***Danılmaz həqiqətdir ki, böyük söz ustaları, bəzən heç özləri də fərqinə varmadan, cəmi iki-üç kəlmə ilə konkret xalqlara mənsub xanımların ümumi portretini yarada biliblər.***

***Demək çətindir, əgər bir rəssamın qarşısında molbert açıb, ondan əsl Azərbaycan qızını xatırladan təsviri sənət əsəri yaratmağı xahiş etsək, kətan üzərində canlandırılan surət necə alınar?! Zahiri cizgiləri, baxışları, təxəyyülümüzdəki hansı obrazı xatırladar?! Gözlərinin ifadəsi daxili dünyasına necə bələdçilik edər?!***

***Bircə həqiqəti bilirəm ki, Cəfər Cabbarlının ”Firuzə” hekayəsindən başlanğıcda xatırladığım ikicə cümlənin ruhunu duymadan dünyanın heç bir rəssamı o portreti mükəmməlcə yarada bilməz...***

*Aida İmanquliyeva-75*

# ANA abidəsi

Aida İmanquliyevanın bütün şəkilləri Cəfər Cabbarlının o unudulmaz cümlələrini xatırladır və dünya şərqşünaslığı tarixində görkəmli yer tutan bu Azərbaycan qadınının həyatı, elmi-yaradıcılıq fəaliyyəti ilə daha yaxından tanış olduqca, haqqındakı xatirələri vərəqlədikcə o cümlələrdəki rəsmindən boylanan bu xeyirxah, nəcib, mütəfəkkir qadın obrazına heyranlıq duymaya bilmirsən.

”Mənim anam ağlasığmaz dərəcədə gözəl qadın olub. O, istənilən yerə daxil olan zaman hamı qeyri-ixtiyari dönüb ona baxardı”...

Mehriban xanım Əliyeva anasını həm də belə xatırlayır:

- O, hədsiz dərəcədə mehriban və kifayət qədər qapalı qadın idi. Anam Azərbaycanda ilk qadın professor, şərqşünaslıq üzrə elmlər namizədi idi. Görünür, o məndə yüksək məsuliyyət hissini formalaşdırmağı bacarıb... Aida xanım unudulmaz bir şəxsiyyət idi. O, qısa, amma çox parlaq və xoşbəxt həyat yaşamışdır. Azərbaycan qadınına xas olan ən gözəl xüsusiyyətləri özündə cəmləşdirmişdi. Yüksək savadlı, ziyalı, vətənpərvər, prinsipial bir alim, eyni zamanda çox zərif, çox gözəl, bütün sevgisini ailəsinə bağışlayan, hər zaman ürəkdən kömək göstərməyə hazır olan bir qadın idi.

Görkəmli şərqşünas alim Aida Nəsir qızı İmanquliyeva 1939-cu il oktyabr ayının 10-da Bakı şəhərində - ziyalı ocağında dünyaya göz açmış, ailəsində gördüyü yüksək mənəvi-əxlaqi dəyərlər onun xarakterinə, ruhuna hopmuşdu.

Aida xanımın hələ erkən yaşlarından yüksək bilik, savad almaq, yazıb-yaratmaq, cəmiyyət üçün faydalı insan kimi yetişmək istəyi elə kökdən, gendən gəlirdi. Özünütəsdiq əzmi, bir də həyatda layiqli mövqe tutmaq arzusu ilə orta məktəb illərindən gecəsini gündüzünə qataraq səylə çalışan, ən müxtəlif fənləri eyni səviyyədə mənimsəyən gənc Aidanın bu zəhməti hədər getmədi: gələcəyə böyük ümidlərlə yanaşıb təhsil aldığı 132 saylı orta məktəbi qızıl medalla başa vuraraq həyatının daha bir uca mərhələsinə qalxmağa, tələbə adını daşımağa nail oldu.

1957-ci ildə Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin ərəb filologiyası bölməsinə daxil olan Aida İmanquliyeva tələbəlik illərində də eyni həvəslə, səylə çalışaraq təhsili, intellekti, peşəsinə vurğunluğu, nizam-intizamı ilə qısa zamanda müəllimlərinin dərin rəğbətini qazandı. Azərbaycan ərəbşünaslığının banisi, professor Ələsgər Məmmədovdan dərs alaraq ərəb dilini mükəmməl öyrənən Aida xanımın tələbəlik illərindən elmi tədqiqata həvəsi də ətrafdakıların diqqətini çəkirdi. 1962-ci ildə ADU-nun Şərqşünaslıq fakültəsinin ərəb filologiyası bölməsini bitirdikdən sonra ömrünü elmə bağlamaq niyyətini özü üçün tam yəqinləşdirdi və imtahanları müvəffəqiyyətlə verərək universitetin Yaxın Şərq xalqları ədəbiyyatı tarixi kafedrasının aspiranturasına daxil oldu.

Görkəmli şərqşünas Rüstəm Əliyevin rəhbərliyi ilə ”Qələmlər birliyi və Mixail Nüaymənin yaradıcılığında onun rolu” mövzusunda namizədlik dissertasiyası üzərində işləməyə başladı. Aspirant kimi tədqiqatçılıq əzmi yüksək dəyərləndirilərək Moskva şəhərinə göndərildi, təhsilini SSRİ Elmlər Akademiyasının Asiya Xalqları İnstitutunun aspiranturasında davam etdirdi.

1964-cü ildə ”Azərbaycan” jurnalında ”Mixail Nüaymə və XIX əsr qabaqcıl rus ədəbiyyatı” adlı ilk məqaləsi dərc olundu. Gərgin zəhməti sayəsində elmi tədqiqatlarını qısa müddətdə yekunlaşdıran Aida İmanquliyeva 1966-cı ilin martında hər iki elmi rəhbərinin - Rüstəm Əliyevin və İosif Braginskinin xeyir-duası ilə namizədlik dissertasiyası müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi aldı.

Bakıya döndükdən sonra Azərbaycan Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunda işə başlayan Aida İmanquliyevanın gələcək həyatı da bu elm məbədi ilə bağlı oldu. 1966-cı ildə institutda kiçik elmi işçi kimi fəaliyyətə başladı. 1973-1988-ci illərdə böyük elmi işçi kimi ərəb filologiyası şöbəsinin müdiri, 1988-1991-ci illərdə elmi işlər üzrə direktor müavini vəzifəsinə irəli çəkildi, 1989-cu ildə Tbilisi şəhərində doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək, filologiya elmləri doktoru elmi dərəcəsi aldı. Nəhayət, 1991-ci ildən həyatının sonunadək - 1992-ci ilin 19 sentyabrınadək direktor vəzifələrində çalışdı.

Bunlar onun cəmi 52 illik ömründə qazandığı nailiyyətlərin yalnız cüzi bir hissəsidir. Bu nailiyyətlərin müfəssəl təsvirini verməyə çalışsaq, bir çox təfərrüatlara da toxunmalıyıq. Görkəmli alim institutda fəaliyyət göstərən ”Asiya və Afrika ölkələri xalqları ədəbiyyatı” ixtisası üzrə Müdafiə Şurasının üzvü, sədr müavini və sədri olmuşdu. Moskva, Düşənbə, Tbilisi, Hamburq, Küveyt, Poltava, Sankt-Peterburq və digər şəhərlərdə keçirilmiş elmi konfranslarda məruzələrlə çıxış etmişdi. Aida xanımın bilavasitə rəhbərliyi altında ərəb filologiyası şöbəsində güclü kadrlar hazırlanır, ərəb ədəbiyyatının, ərəb-Azərbaycan ədəbi əlaqələrinin ən müxtəlif sahələrini araşdıran monoqrafiyalar, kitablar hazırlanıb çap olunurdu.

Bir sıra ictimai işlərdə də fəal iştirak edən Aida xanım İmanquliyeva Ümumittifaq Şərqşünaslar Cəmiyyəti Rəyasət Heyətinin, habelə Şərq ədəbiyyatının tədqiqi üzrə Ümumittifaq Koordinasiya Şurasının üzvü olmuşdur. 1981-ci ildə həm də Azərbaycan Yazıçılar İttifaqının üzvlüyünə qəbul olunmuşdur.

Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakültəsində ərəbşünas mütəxəssislərin hazırlanması işində də Aida xanımın böyük xidmətləri vardı. O, tələbələrində elmi tədqiqata həvəs oyadır, bir çox dissertasiya işlərinə elmi rəhbərliyin əziyyətini məmnuniyyətlə üzərinə çəkirdi. Onun başçılıq etdiyi ərəb filologiyası şöbəsində qısa müddətdə 10-dan artıq namizədlik dissertasiyası müdafiə edilmişdi.

***

Aida xanım həmişə öz dərin elmi biliyini gənc alim və aspirantlarla bölüşür, əlindən gələn köməyi onlardan əsirgəmirdi. Tanıyanlar onun son dərəcə zəhmətkeş və özünə qarşı həddindən artıq tələbkar bir alim olduğunu yaxşı bilirdilər.



Aida xanımın qələmindən çıxan hər bir əsər gərgin, böyük bir zəhmətin nəticəsidir. Bütün bu deyilənlərin arxasında yüksək insani keyfiyyətlərə malik, təvazökar, mehriban, xeyirxah, gözəl, xanım-xatın bir Azərbaycan qadını və ana abidəsi dururdu. Bu keyfiyyətləri ona bütün həmkarlarının ehtiramını və məhəbbətini qazandırmışdı.

Professor Aida İmanquliyeva həm keçmiş Sovet İttifaqında, həm də Azərbaycanda yeni ərəb ədəbiyyatı kursunun yaradıcılarından sayılır. Ərəb dünyasında yaranmış zəngin ədəbiyyatı araşdırmaq, həmin ədəbiyyatın səciyyəvi cəhətlərini müəyyənləşdirmək, görkəmli nümayəndələrinin həyat və yaradıcılığını öyrənmək, əsərlərini yüksək nəzəri səviyyədə təhlil etmək dünya ərəbşünaslığı qarşısında duran ümdə vəzifələrdəndir. Aida xanım sağlığında bu sahədə böyük əmək sərf etmiş, nəticədə belə bir çətin kursun nəzəri-metodoloji əsaslarının yaradılmasına nail olmuşdur. Görkəmli alimin bu barədə yazdığı məqalələr, beynəlxalq forumlarda etdiyi çıxışlar, uzun illər BDU-nun Şərqşünaslıq fakültəsində oxuduğu mühazirələr yeni ərəb ədəbiyyatının çağdaş dövrdə daha dərindən öyrənilməsi baxımından əvəzsiz mənbə rolunu oynayır.

Aida xanımın sağlığında gərgin zəhmət hesabına ərsəyə gətirdiyi əsərlərinə bu gün ölkə hüdudlarından kənarda - Rusiyada, Ukraynada, Almaniyada, İngiltərədə, Fransada, Özbəkistanda, Gürcüstanda, eləcə də əksər ərəb ölkələrində də geniş müraciət olunur.

2009-cu ilin 10 oktyabrında Bakıda, görkəmli alimin 70 illik yubileyinə həsr edilən ”Şərq və Qərb: ortaq mənəvi dəyərlər, elmi-mədəni əlaqələr” mövzusunda Beynəlxalq İbn Ərəbi simpoziumundakı çıxışı zamanı İbn Ərəbi Cəmiyyətinin sədri Qrenvill Kollinz maraqlı bir fikir səsləndirdi: ”Növbəti simpoziumun Bakıda keçirilməsi ilə bağlı təklifi eşidəndə bir qədər təəccübləndik. Biz Azərbaycanda İbn Ərəbi nəzəriyyəsini araşdıran alimlərin olmadığını düşünürdük. Ancaq sonradan məlum oldu ki, biz haqlı deyilik. Azərbaycanda İbn Ərəbi yaradıcılığı geniş tədqiq edilmişdir. Bu istiqamətdə görkəmli şərqşünas Aida İmanquliyevanın xidmətlərini xüsusi qeyd etmək istəyirəm”.

Rusiya Elmlər Akademiyasının prezidenti Yuri Osipov da Aida İmanquliyevanın şərqşünaslıq elminə böyük töhfələr verdiyini, ərəb məhcər (mühacir) ədəbiyyatının tədqiq olunmasında məxsusi xidmətlərinin olduğunu göstərmişdir. Eyni zamanda İslam Konfransı Təşkilatı Parlament Assambleyasının baş katibi professor Mahmud Erol Kılıc da Aida İmanquliyevanı ərəb ədəbiyyatının tədqiqinə böyük töhfələr verən görkəmli Azərbaycan alimi kimi dəyərləndirmişdir.

***

Aida xanım öz əsərlərində daim Şərqlə Qərb dialoqunun əldə olunması üçün ortaq məqamların tapılmasına çalışır, Şərq mənəvi dəyərlərinin, müsəlman əxlaqının böyük təəssübkeşi olmaqla Qərb dəyərlərinə sivil münasibət, sivilizasiyalararası dialoq problemini də özünəməxsus tərzdə gündəmə gətirir, bu məsələnin elmi şərhinə zəhmət sərf edirdi. Şərq və Qərb mədəniyyətlərinin qarşılıqlı təsir və əlaqələrini öyrənərkən alim hər iki ədəbiyyatın ümumbəşəri dəyərlərini əsas götürür, mədəni tərəqqini şərtləndirən amillərə istinad edirdi.

Onun əsas araşdırmaları ərəb ədəbiyyatının yeni mərhələyə qədəm qoymasında böyük xidmətləri olmuş Əmin ər-Reyhaninin, Cübran Xəlil Cübranın, Mixail Nüaymənin yaradıcılığına həsr edilmişdi. O, adıçəkilən mütəfəkkirlərin yaradıcılığı barədə keçmiş İttifaq məkanında tədqiqat aparan ilk alimlərdən idi.

Aida xanım İmanquliyeva ərəb məhcər ədəbiyyatının görkəmli nümayəndələrindən olan Cübran Xəlil Cübranın və Əmin ər-Reyhaninin daha çox Qərb romantizminin, Mixail Nüaymənin isə rus tənqidi realizminin təsirinə məruz qaldığını göstərir, bunun əsas səbəbini onların dünyagörüşü, düşdükləri mühitin ədəbi-bədii qayəsi və yaradıcılıq istiqamətləri ilə əsaslandırırdı.

Aida xanım romantik poeziyanı onun Qərbdə C.Bayron, U.Bleyk, R.Emerson, U.Uitmen, Şərqdə isə C.Cübran, Ə.Reyhani, M.Nüaymə kimi məşhur nümayəndələrinin timsalında araşdırır, bir tərəfdən hiss və əqlin, digər tərəfdən Şərq ilə Qərb düşüncə tərzlərinin vəhdət məqamlarını üzə çıxararaq, bəşəriyyətin məhz bu harmoniyaya doğru inkişaf etmək əzmini təsbit etməyə çalışırdı. Öz tədqiqatlarında da poetik ruhla fəlsəfi düşüncənin vəhdətindən çıxış edən Aida xanım Azərbaycan ədəbi və fəlsəfi fikrində ilk dəfə olaraq Şərq və Qərb romantiklərinin geniş müqayisəli təhlilini aparmışdır.

Alimin çoxillik araşdırmalarının bəhrəsi olan ”Mixail Nüaymə və Qələmlər birliyi” (Moskva,1975), ”Cübran Xəlil Cübran” (Bakı, 1975), ”Yeni ərəb ədəbiyyatı korifeyləri” (Bakı,1991) monoqrafiyaları dünya ərəb ədəbiyyatşünaslığı üçün mühüm əhəmiyyət kəsb edən fundamental əsərlərdir.

Ümumiyyətlə, professorun 3 monoqrafiya, 70-dən çox elmi məqaləsində Qərb və Şərq mədəni ənənələrinin sintezi, yaradıcı üslubun inkişafı və yeni bədii cərəyanların təşəkkülü geniş surətdə tədqiq edilmişdir. Aida xanım İmanquliyeva təkcə şərqşünaslıq sahəsində deyil, həmçinin Şərq və Qərb arasında elmi və mədəni əlaqələrin, ortaq mənəvi dəyərlərin aşkar edilməsində də səmərəli fəaliyyət göstərmişdir.

***

Müasirləri haqlı olaraq Aida İmanquliyevanın bu gün Azərbaycanın köksündə möhtəşəm bir reallığa çevrilən qədim İpək yolunu öz qələmi ilə çəkdiyini qeyd edirlər. Onun əsərlərindən aydın görünən bu yol Qərblə Şərqi birləşdirən ədəbi-fəlsəfi fikir sistemi, özlüyündə həm dünya mədəniyyətinin, ümumbəşəri mənəvi dəyərlərin öyrənilməsi, həm də və ən başlıcası isə milli özünüdərkin ifadəsi kimi qiymətlidir.

Aida xanım hələ ötən əsrin 70-ci illərində sərhədlərin qapalı olduğu, sovet ideologiyasının hakim olduğu dövrdə ulu öndər Heydər Əliyevin xalqın mənəvi ruhunun mühafizəsi üçün böyük fədakarlıqla yaratdığı imkanlardan bəhrələnərək vətəndaş ziyalı, qüdrətli alim kimi öz sözünü demiş, insanları, dövlətləri İpək yoluna səsləmişdir.

Aida xanım bu missiyanı yalnız öz elmi yaradıcılığı ilə məhdudlaşdırmır, şərqşünaslıq elminə yenicə qədəm qoyan aspirant və dissertantları da məhz Şərq və Qərbin dialoquna, dünyanın xilası naminə belə bir təmasın yaranmasında böyük tarixi-mənəvi perspektivlər vəd edən Türk dünyasının öyrənilməsinə istiqamətləndirirdi.

Aida İmanquliyeva mütərcimlik sahəsində də böyük səriştə sahibi idi. O, ərəb ədəbiyyatının bir sıra şedevrlərini dilimizə məharətlə çevirmişdir. Mixail Nüaymənin ”Buz əriyəcək”, ”İnsan və quş”, ”Qu-qu” saatı”, Mahmud əz-Zahirin ”Üsyan”, Məhəmməd Dibin ”Xasın dərmək”, Sahib Camalın ”Yusif”, Süheyl İdrisin ”Azadlıq” və Qənəma Məcid Zeyyibin ”Növbəyə dayanmaq” hekayələrinin orijinal üslubda dilimizə tərcüməsi məhz ona məxsusdur.

***

Çox gərgin iş rejimi Aida xanımı analıqdan və xanımlıqdan məhrum edə bilməmişdi. O, hər şeydən əvvəl, öz ailəsini, həyat yoldaşını çox sevən gözəl qadın, qayğıkeş bir ana idi. Aida xanım həyat yoldaşı, görkəmli alim Arif Paşayevlə birgə sevimli qızları Nərgiz və Mehribanın təlim-tərbiyəsi ilə çox ciddi məşğul olardı. Elmi-inzibati işlərlə həddindən çox yüklənməsinə baxmayaraq, sevimli nəvələrini bir an unutmaz, onların qayğısını çəkərdi.

Əgər Uca Tanrının yer üzündə insanların baxıb öyrənmələri, örnək götürmələri üçün mələk xislətli, mələk ruhlu insanlar yaratdığına inansaq, tam əminliklə söyləyə bilərik ki, Aida xanım da belələrindən idi. O, həmişə yaxşılıq etməyə çalışar, adamlarda işıqlı cəhətlər axtarardı. Bu incə ruhlu qadında polad mətinliyi də vardı. Aida xanım elm adamları üçün ən çətin, kəşməkəşli bir dövrdə AMEA-nın Şərqşünaslıq İnstitutuna rəhbərlik etmişdi.

O, çalışdığı bütün vəzifələrdən bir pillə üstün idi...

Ona görə də heç bir vəzifə Aida xanımı başqalaşdıra, insanlara münasibətini dəyişə, insanpərvərliyinə xələl gətirə bilməzdi. Aida xanım İmanquliyevanın alimliyini onun Tanrının yalnız sevdiklərinə bəxş edə biləcəyi gözəl, bənzərsiz keyfiyyətləri tamamlayırdı. Yüksək vəzifələr, elmi titullar, ictimai həyatda fəallıq onu bu ümdə insani keyfiyyətlərdən əsla məhrum edə bilməmişdi. Bunu uzun illər görkəmli alimlə birgə çalışmış həmkarları daha yaxşı xatırlayırlar.

Zahiri və daxili gözəllik, sadəlik, mehribanlıq, həssaslıq, humanizm, insanseverlik onun müsbət aurasını daha da cəlbedici edirdi. Görkəmli alim alicənablığı, mərhəmətliyi, xeyirxahlığı, başqalarına diqqət və qayğısı ilə öz tələbələrinə təkcə ərəbşünaslıq elminin incəliklərini öyrətmirdi.

Şəxsiyyət olaraq da Aida xanım öz mühiti üçün əsl insanlıq mücəssəməsi, canlı örnək idi. Onun daxili və zahiri gözəlliyini yüksək qiymətləndirən insanlar Aida xanımı ideal qadın obrazı kimi qəbul edərək böyük ehtiram göstərirdilər və bunlar təkcə gənc nəslin nümayəndələri deyil, həm də bir zamanlar Aida xanımın özünün dərs aldığı, əsərlərindən öyrəndiyi ustadlar idi.

***

Təqvimdə 1992-ci ilin 19 sentyabrı...

Doğma övladlarının qürur duyulası fəaliyyəti, yetirdiyi alimlərin uğurları, onun şəxsiyyətindən nələrsə əxz etmiş insanların həyatı Aida xanımın yarımçıq qırılmış ömrünün davamı, yaşaya bilmədiyi illərin təsəllisidir. 23 noyabr 2006-cı ildə Heydər Əliyev Fondunda görkəmli şərqşünas alim, professor Aida İmanquliyevanın ”Yeni ərəb ədəbiyyatının korifeyləri” kitabının təqdimatına və Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevaya İslam Ölkələri Təhsil, Elm və Mədəniyyət təşkilatının (ISESCO) xoşməramlı səfiri adının verilməsinə həsr edilmiş mərasimdəki çıxışı zamanı Mehriban xanımın anası haqqında söylədiyi bu kəlmələr kimi:

- Aida xanım unudulmaz bir şəxsiyyət idi. O, qısa, amma çox parlaq və xoşbəxt həyat yaşamışdır. Azərbaycan qadınına xas olan ən gözəl xüsusiyyətləri özündə cəmləşdirmişdi. Yüksək savadlı, ziyalı, vətənpərvər, prinsipial bir alim, eyni zamanda çox zərif, çox gözəl, bütün sevgisini ailəsinə bağışlayan, hər zaman ürəkdən kömək göstərməyə hazır olan bir qadın idi. Aida xanımın bütün elmi yaradıcılığı Azərbaycan ilə Şərq dünyası arasında əlaqələrin qurulub möhkəmlənməsinə yönəldilmişdi. Eyni zamanda, o, Azərbaycan elminin düşüncələrinin, fəlsəfəsinin islam aləmində yayılmasına nail olmuşdu. Bu gün müstəqil Azərbaycanda, demək olar ki, Aida xanımın bütün arzuları artıq reallıqdır və respublikamız müsəlman ölkələri, islam dünyası ilə nəinki elmi-mədəni əlaqələr, həm də ən yüksək səviyyədə iqtisadi, siyasi əlaqələr qurubdur. Bütün bu sahələrdə Aida xanımın məktəbinin yetirmələrini, onun davamçılarını görürük. Ona görə Aida xanımın arzuları, onun elmi irsi bu gün də yaşayır və dövlətimizə xidmət edir.

”Ailə ənənələrimizdə, yəqin ki, ən ümdə məsələ qadına olan münasibətdir. Təkcə qadını sevmək və ona dəyər vermək deyil, həm də onu qorumaq bacarığıdır. Həyat yoldaşım çox gözəl qadın idi, - bu da Aida xanımın ömür-gün yoldaşı, akademik Arif Paşayevin düşüncələrindən yaddaşımıza köçüb: - Çox erkən, gənc yaşında həyatdan köçdü. Onu qorumaq üçün əlimdən gələni etdim, ancaq bədbəxtlik heç gözləmədiyimiz bir anda bizi haqladı. İllər keçdikcə, əlbəttə, ağrı azaldı. Amma acısı, göynərtisi hələ də ürəyimdədir. Onun xatirəsi hər vaxt bizimlədir - mənimlə və qızlarımla...”

Ənənələrə gəlincə, onları yaşadan və yeni nəslə ötürən qadınlardır. Məhz onlar bizim üçün əziz olan dəyərlərin keşiyində dayanıblar...

Bir rəmz, bir abidə kimi ucalıblar...

Aida İmanquliyeva rəmzi, Aida İmanquliyeva abidəsi kimi...

**Hüseynbala MİRƏLƏMOV,**
**yazıçı-dramaturq,**
**Milli Məclisin deputatı**

*“Azərbaycan” qəzeti*
*10 oktyabr 2014-cü il №219(6785)*

## Allahın rübaisi

*(Aida İMANQULİYEVAYA)*

*Bəlkə lap dünyaya gəldiyim gündən*
*Mən bütün ruhumla şeirə məftunam.*
*Bütün gözəlliklər şeirdir mənə,*
*Məni şeirə vurğun doğmuşdur anam.*

*Şeirlər içində ən çox sevdiyim*
*Rübai olmuşdur, indi də odur.*
*Hətta Aidaya baxdığım zaman*
*Gözümün önündə rübai durur.*

*Məncə, Aida da bir rübaidir,*
*Yazanı Allahdır bu rübainin.*
*Candan vurulardı, görsəydi onu*
*Rübai allahı Xəyyam da, yəqin.*

*Aida ilahi bir rübaidir,*
*Gözləri, qaşları iki beyt kimi.*
*Füzuli şeirinin iki şah beyti -*
*Gözəllik heykəli, könül hakimi.*

*Məcnun ilə Leyli evlənsəydilər,*
*Uşaqları, yəqin, ona bənzərdi.*
*Bir qız doğulsaydı nikahlarından,*
*O əsmər nazənin ona bənzərdi.*

*Aida baxarsa axar bir suya,*
*O su dəyişilib gülab olacaq.*
*Aidanın əksi düşsə güzgüyə,*
*Güzgünün qucağı güllə dolacaq.*

*O, Həvva olsaydı, cənnətdə İblis*
*Adəmə yüz kərə səcdə edərdi.*
*Züleyxa olsaydı, bütün cavanlar*
*Yusifə dönərdi, Misrə gedərdi.*

*Mən ona səadət diləkçisiyəm,*
*Ensin ayağına elmin meracı.*
*Diləyim budur ki, ölməyim, görüm*
*Mən onun başında doktorluq tacı.*

**Əkrəm CƏFƏR**

***1980***

# SABAH qrupları haqqında nə bilirik?

**Azərbaycanın ali təhsil tarixində ilk dəfə tətbiq olunan SABAH qrupları layihəsində məqsəd xüsusi istedadı ilə seçilən və təhsildə göstəriciləri ilə fərqlənən tələbələrə yüksək keyfiyyətli təhsil almaq üçün əlverişli şəraitin yaradılmasıdır. Ali məktəb kollektivləri, müəllim və tələbələr tərəfindən də yüksək rəğbətlə qarşılanan bu layihə çərçivəsində artıq 688 tələbə seçilərək SABAH qruplarına daxil edilmiş və cari dərs ilindən tədrisə başlamışdır. Lakin layihənin tətbiqi yönündə görülən işlər barədə KİV vasitəsi ilə ictimaiyyətə vaxtaşırı məlumatların verilməsinə baxmayaraq hələ də bir çox insanlar bu qruplar haqqında kifayət qədər məlumata malik deyil. Bunu nəzərə alıb SABAH qrupları haqqında hazırladığımız materialı təqdim edirik.**

## SABAH qruplarının tarixi

SABAH qruplarının yaradılması ideyası Azərbaycan Respublikasının Təhsil Naziri, son bir ildə Azərbaycanın təhsilində tətbiq olunan bir sıra yeniliklərin təşəbbüsçüsü Mikayıl Cabbarova məxsusdur. Nazir bu təşəbbüs barədə fikirlərini ilk dəfə ötən ilin payızında keçirilmiş mötəbər tədbirlərin birində səsləndirib. Azərbaycan müəllimlərinin XIV qurultayındakı geniş məruzəsində isə nazir növbəti tədris ilindən başlayaraq ali təhsil müəssisələri üzrə SABAH qruplarının təşkili üçün seçim aparılmasının nəzərdə tutulduğunu təhsilin bütün pillələri üzrə nümayəndələrin iştirak etdiyi qurultayın mötəbər tribunasından bir daha bəyan edib və bundan sonra yeni layihənin tətbiqi yönündə işlərə start verilib. Bu il fevralın 13-də "Hyatt Regency" otelində Təhsil Nazirliyinin tabeliyindəki ali təhsil müəssisələrində yaradılacaq SABAH qruplarının rəsmi təqdimatı olub.

Sonra SABAH qruplarına tələbələrin qəbulu qaydaları işlənib hazırlanıb və təsdiq olunub. Bu ilin may ayında ölkənin bir sıra ali təhsil müəssisələrində (ADİU, AMİU, ATU, ADPU, GDU, NDU və s.) SABAH qruplarının təqdimatları keçirilərək həmin ali məktəblərin müəllim və tələbələri yeni layihənin mahiyyəti ilə bağlı məlumatlandırılıb.

## SABAH - savadlı, bacarıqlı, hazırlıqlı tələbələrin təhsil aldığı qrupdur

SABAH abreviaturasının açılışı savadlı, bacarıqlı, hazırlıqlı deməkdir. Bu qruplar məhz bu keyfiyyətlərə malik tələbələrdən formalaşdırılır. Mahiyyət etibarı ilə SABAH qrupları ali təhsil məkanında, ali təhsil müəssisələrində keyfiyyət, tədris, münasibət islahatının rüşeymidir. SABAH-ın əsas məramı ondan ibarətdir ki, yaxın gələcəkdə bütün ali təhsil müəssisələri bu səviyyəyə çatsın.

SABAH qruplarının yaradılması ideyasının əsasında ali təhsilin keyfiyyətinin yüksəldilməsi, ölkəmizə lazım olan yüksək ixtisaslı mütəxəssislərin xaricdə deyil, məhz ölkəmizin ali məktəblərində hazırlanması durur.

SABAH qrupları fərqli mühit, fərqli münasibət, fərqli tədris deməkdir. Fərqli mühit dedikdə tələbəni diqqət mərkəzinə qoyan, ali təhsil müəssisəsi - tələbə, tələbə-tələbə, ali təhsil müəssisəsi - müəllim, müəllim-tələbə münasibətləri fərqli olan bir mühit nəzərdə tutulur.

SABAH qrupları müəyyən ixtisas üzrə peşəkar mütəxəssis olmaq istəyən hər bir tələbəyə yeni imkanlar açır. Bu qrupa qəbul olan tələbə oxuduğu ixtisasın ən yüksək səviyyədə tədrisinin təşkil olunduğu ali təhsil müəssisəsinə köçürülür. Həmin qruplara da keyfiyyətli tədris bacarığı ilə seçilən müəllimlər dərs deyir. Başqa sözlə, müəyyən ixtisas üzrə ən yaxşı tələbələr və müəllimlər vahid məkana gətirilir.

SABAH qrupları burada təhsil alan tələbələrə fərqli gələcək, əmək bazarında daha tez və asan iş tapmaq perspektivi vəd edir. SABAH qrupları nəticə etibarı ilə həm də dövlətin təhsilə, gənclərə qayğısı deməkdir. Bu baxımdan SABAH qruplarının yaradılması ali təhsilin keyfiyyətinin daha da yüksəldilməsi, müasir tələblərə uyğun kadrların sayının artırılması istiqamətində atılmış əhəmiyyətli addım kimi qiymətləndirilir.

## Bu qruplarda 688 tələbə təhsil alır

Hazırda SABAH qruplarında 7 ali təhsil müəssisəsi üzrə 688 tələbə təhsil alır. Bu ali məktəblər Bakı Dövlət Universiteti, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Azərbaycan Texniki Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti, Azərbaycan Dövlət Neft Akademiyası, Azərbaycan Dövlət Pedaqoji Universiteti və Azərbaycan Dillər Universitetidir.

688 tələbənin böyük əksəriyyəti - təxminən 560 nəfəri üç ali məktəbdə (Bakı Dövlət, Azərbaycan Dövlət İqtisad universitetlərində və Neft Akademiyasında) təhsilə cəlb olunub. Qalan tələbələr isə dörd ali məktəbin (Azərbaycan Memarlıq və İnşaat Universitetinin, Azərbaycan Dövlət Pedaqoji Universitetinin, Azərbaycan Dillər Universitetinin və Azərbaycan Texniki Universitetinin) payına düşür.

Tələbələrin ali təhsil müəssisələri üzrə bölgüsü isə təxminən belədir: Bakı Dövlət Universiteti - 230 nəfər, Azərbaycan Dövlət İqtisad Universiteti - 224 nəfər, Azərbaycan Dövlət Neft Akademiyası 106 nəfər, Azərbaycan Dillər Universiteti - 50 nəfərdən çox və s.

Bu il SABAH qruplarına qəbul üçün 53 ixtisas üzrə elan verilməsinə baxmayaraq, bu ixtisaslar üzrə ərizə verən və müsabiqədən keçən tələbələrin heç də hamısını SABAH qruplarına daxil etmək mümkün olmayıb. Belə ki, qruplar formalaşdırılarkən Nazirlər Kabinetinin ali məktəblərdə qrupların formalaşdırılması ilə bağlı göstərişi nəzərə alınıb. Məlum olduğu kimi, bu göstərişə əsasən ali təhsil müəssisələrində qruplar minimum 15, maksimum 30 tələbədən ibarət olmaqla formalaşdırılır. Bu baxımdan eyni ixtisas üzrə bu göstəricidən çox tələbə sayı olan ixtisaslardan qruplar formalaşdırılıb, daha az - 5-6 nəfər tələbə sayı olan bəzi ixtisaslar üzrə isə qruplar formalaşdırmaq mümkün olmadığından onlardan imtina edilib.

Tədris dili ilə bağlı da vəziyyət, təxminən, bu cür olub. Müsabiqədə ali təhsil müəssisələrinin Azərbaycan, rus və ingilis dili bölmələrində təhsil alan tələbələrinin iştirak etməsinə və seçilməsinə baxmayaraq, tələbə sayı azlığından rus və ingilis dili bölmələri üzrə qruplar yaradılması mümkün olmayıb. Bu dillərdə təhsil alan tələbələrə təhsillərini Azərbaycan bölməsində davam etdirmək təklif olunub. Razılaşanlar müvafiq ərizələr alınmaqla uyğun ixtisaslar üzrə Azərbaycan bölməsi qruplarına daxil edilib.

Nəticə etibarı ilə indi ali təhsil müəssisələrində yalnız Azərbaycan bölməsi üzrə qruplar fəaliyyət göstərir.

## Tələbələrin seçimi xüsusi qaydalar əsasında aparılır

SABAH qruplarına tələbələrin qəbulu Təhsil Nazirliyi tərəfindən təsdiq olunmuş xüsusi qaydalar əsasında aparılır. Bu qaydalara əsasən Azərbaycan Respublikasında fəaliyyət göstərən ali təhsil müəssisələrində I kurs tələbələrinin SABAH qruplarına qəbulu mərkəzləşdirilmiş qaydada üç mərhələli müsabiqə yolu ilə, elektron proqram təminatı tətbiq olunmaqla həyata keçirilir.

Müsabiqənin I mərhələsi tələbələrin elektron qaydada Təhsil Nazirliyinin saytında yerləşdirilmiş qeydiyyat forması əsasında qeydiyyata alınması və elektron ərizədəki göstəricilərin qiymətləndirilməsi, II mərhələsi xarici dil və məntiq üzrə hər biri 25 sual olmaqla 50 sualdan ibarət test imtahanının keçirilməsi, III - sonuncu mərhələsi isə test imtahanından uğurla keçən tələbələrlə müsahibənin aparılmasını əhatə edir.

Müsabiqənin yekun nəticələrinə əsasən tələbələr SABAH qruplarına qəbul edilir. Qəbul olunmuş tələbələr müəyyənləşdirildikdən sonra onların siyahısı Təhsil Nazirliyinin əmri ilə təsdiq olunur və müvafiq siyahılar baza ali təhsil müəssisələrinə göndərilir.

Məlumat üçün bildirək ki, SABAH qruplarına builki seçim proseduru da bu qaydalar çərçivəsində təşkil olunub. Belə ki, SABAH qruplarına daxil olmaq üçün mayın 12-dən iyunun 15-dək ərizə qəbulu aparılıb. Bu müddət ərzində seçimin aparılacağı təhsil, təbiət, humanitar və sosial, iqtisadiyyat və idarəetmə, texniki və texnoloji ixtisas qruplarına daxil olan 53 ixtisas üzrə 2500-dən çox tələbə qeydiyyatdan keçib.



İyulun 6-da Təhsil Nazirliyi tərəfindən Azərbaycan Dövlət İqtisad və Naxçıvan Dövlət universitetlərində SABAH qruplarına qəbul imtahanları keçirilib. İmtahanlarda 1154 nəfər namizəd iştirak edib.

İyulun 17-dən başlayaraq isə üç gün ərzində SABAH qruplarına daxil olmaq istəyən namizədlərlə müsahibə aparılıb. Müsahibə mərhələsinə II mərhələnin yekunlarına əsasən yetərli bal toplayan 24 ixtisas üzrə 750-yə yaxın tələbə buraxılıb.

Sonda tələbələrin akademik göstəriciləri, test imtahanından topladığı ballar, müsahibənin nəticələri təhlil olduqdan sonra SABAH qruplarının tərkibi müəyyənləşdirilib və deyildiyi kimi 688 tələbə bu qruplarda təhsil almaq hüququ qazanıb.

## SABAH qruplarında seçilmiş müəllimlər tədris aparır

SABAH qruplarında dərs demək üçün ali təhsil müəssisələrində işləyən professor-müəllim heyətindən müəllimlər də seçim yolu ilə müəyyənləşdirilib. Müəllimlərin seçilməsi üçün Təhsil Nazirliyində 5 ixtisas qrupu üzrə komissiyalar yaradılıb. Həmin komissiyaların tərkibinə təkcə Təhsil Nazirliyindən deyil, ali təhsil müəssisələrindən, elmi-tədqiqat institutlarından, sənayedən nümayəndələr, müvafiq sahələr üzrə öz sözünü demiş nüfuzlu peşəkar müəllimlər, şirkət rəhbərləri daxil edilib.

Müsahibədə iştirak edən müəllimlərin siyahısı tutulub, onlara yekun qiymət verilib və həmin qiymət əsasında da onlara SABAH qruplarında öz ixtisasları üzrə dərs demək təklif olunub.

Seçim zamanı müəllimin tədris təcrübəsi, tədris etdiyi fənn üzrə mövcud ədəbiyyatla tanışlığı, müasir tədris metodikalarından və texnologiyalarından istifadə edib-etməməsi, ümumi dünyagörüşü, xarici dil bilməsi, auditoriyanı diqqət mərkəzində saxlamaq üçün hansı üsullardan istifadə etməsi və s. kimi məsələlərə diqqət yetirilib və ən qabaqcıl müsbət nəticələrə malik olan müəllimlər seçilib.

## Bu qruplarda tədris necə təşkil olunur?

SABAH qruplarında tədris xüsusi proqramlar əsasında aparılır. Burada tədrisin əsasını təşkil edən ali təhsil müəssisəsi - tələbə, tələbə-tələbə, tələbə-müəllim münasibətləri adi qruplardakından fərqlənir və qarşılıqlı səmimiyyət, hörmət, işgüzarlıq, birgə fəaliyyət və s. kimi prinsiplər əsasında qurulur. Bu qruplarda tədrisin ən böyük fərqi isə xarici dilin - ingilis dilinin daha intensiv tədris olunmasıdır. Belə ki, bu qruplarda həftədə 6 saat olmaqla ildə 180 saat ingilis dilinin tədrisi nəzərdə tutulub.

İngilis dilinin tədrisində yeni yanaşmalardan istifadə olunur. Bu qruplarda dərs demək üçün seçilmiş müəllimlərlə yanaşı ingilis dilinin tədrisi, ingilis mədəniyyətinin təşviqi ilə məşğul olan, Azərbaycanda 20 illik işləmək təcrübəsinə malik British Council təşkilatının sertifikatlaşmasından keçmiş azərbaycanlı müəllimlər, dil daşıyıcıları olan, yəni ingilis dili onlar üçün ana dili olan, dünyanın bir sıra ölkələrində ingilis dilinin tədrisi sahəsində böyük təcrübə toplamış xarici mütəxəssislər dəvət olunur.

Tədrislə, akademik mühiti ilə sənaye mühitinin vəhdətini yaratmaq məqsədi ilə SABAH qrupları ilə tədris prosesinə sənayedən gələn mütəxəssislər, şirkət rəhbərləri, şirkətlərin məsul işçiləri də cəlb olunur. Onlar mühazirələr oxuyur, tələbələrlə ünsiyyət yaradırlar.

Belə şirkətlərlə ünsiyyət SABAH qruplarında oxuyan tələbələrin istehsalat təcrübəsinin təşkilində, məzunun gələcəkdə işlə təmin olunmasında yeni imkanlar əldə etməyə şərait yaradır. Eləcə də tələbələrin elmi-tədqiqat işləri ilə maraqlanmasında bu qruplar üstün mövqeyə malikdir. Məsələn, hansısa SABAH qrupunda tədris aparan professor aktual bir mövzunun araşdırılması ilə bağlı yeni bir fəaliyyət, çözüm metodları tapır və onları istehsalata tətbiq edir. Belə əməkdaşlıq nəticəsində əldə olunan yenilikləri həmin professor dərhal tədris etdiyi auditoriyada birbaşa tələbələrə çatdırır. Nəticədə sənayedən tədrisə keçid daha da yaxınlaşmış olur.

## Tələbələr bir sıra imtiyazlardan istifadə edirlər

SABAH qruplarında təhsil alan tələbələr xüsusi imtiyazlara malikdir. Birinci imtiyaz, irəlidə qeyd etdiyimiz kimi, bu qruplarla adi qruplar arasında tədris fərqinin olması, SABAH qruplarında mühazirələri oxumaq üçün xaricdən müəllimlərin dəvət olunmasıdır. Burada ingilis dilinin intensiv proqramla öyrədilməsi də imtiyaz hesab oluna bilər.

Digər bir imtiyaz SABAH-ın tələbələrinə əlavə təqaüdlərin verilməsidir. Əlavə təqaüd SABAH qruplarına qəbul olunmuş bütün tələbələrə, istər dövlət sifarişli ixtisaslar üzrə oxuyan, istərsə də ödənişli əsaslarla təhsil alan tələbələrə ödənir. Məsələn, dövlət sifarişli ixtisas üzrə oxuyan tələbə həm öz təqaüdünü, həm də SABAH-da oxuduğu üçün əlavə təqaüd alır. Ödənişli əsasla oxuyanlar isə yalnız SABAH təqaüdü alırlar. Başqa ali təhsil müəssisəsindən gəlmiş ödənişli əsaslar üzrə təhsil alan tələbələr ikinci kursdan başlayaraq təhsil haqlarını SABAH qruplarında oxuduğu ali məktəbə köçürürlər.

SABAH qruplarında təhsilin tələbələrə verdiyi bir üstünlük də yataqxana ilə təminatdır. Belə ki, təxminən 300 tələbə yerlik, yüksək səviyyədə təmir olunmuş yataqxana onların istifadəsindədir. Yataqxanada yer ehtiyac duyan, rayon qeydiyyatında olan və qalmağa yeri olmayan tələbələrə rəsmi müraciət əsasında ayrılır. Həmin yataqxanada yaşayan tələbələrə gündə üç dəfə pulsuz yemək verilir. Orada tələbələrə mərkəzləşdirilmiş qaydada iaşə xidməti göstərilir.

## Ali məktəblərdə ödənişli əsaslarla təhsil alan tələbələr də bu qruplarda oxuya bilərlər

Daxil olduqları və 1 il oxuduqları dövlət ali təhsil müəssisələrində ödənişli əsaslarla təhsil alan tələbələr də SABAH qruplarına daxil ola və təhsilini bu qruplarda davam etdirə bilərlər. Bu il SABAH qruplarına qəbul olunan tələbələr arasında belələri vardır. Əslində tələbələrə qeydiyyat açıq elan olunur. Qeydiyyat üçün əsas şərt isə, irəlidə deyildiyi kimi, tələbənin daxil olduğu ali məktəbdə SABAH qrupları üçün müəyyən edilmiş ixtisas üzrə I tədris ilinin I semestrinin nəticələrinə görə 61 bal toplanmasıdır. Ona görə də müvafiq akademik göstəricisi olan və ölkəmizdə fəaliyyət göstərən 33 ali təhsil müəssisəsində (xüsusi təyinatlılar istisna olmaqla) oxuyan tələbələr iştirak edə bilər.

## Qəbul imtahanlarının nəticələri seçimdə nəzərə alınırmı?

SABAH qrupları müvafiq akademik göstəriciləri (I semestrin nəticələrinə görə 61 bal) olan və 3 mərhələdən ibarət müsabiqədən uğurla keçib müsbət nəticələr əldə etmiş tələbələrdən formalaşdırılır. Əgər bu prosesdə eyni nəticə göstərmiş 2 nəfər olursa, yəni onların balları və digər nəticələri eyni olursa, bu zaman tələbənin qəbul imtahanlarındakı yüksək nəticələri nəzərə alınır və seçimdə ona üstünlük verilir. Amma bu konkret halda, konkret ixtisasdan, ali məktəbdən asılı ola bilir.

SABAH qruplarına tələbələri seçdikdə ilkin olaraq onların yarımillik təhsilinin nəticələri əsas götürülür. Mövcud SABAH qruplarının tərkibi göstərir ki, bu qrupda oxuyan tələbələr arasında ali məktəblərə qəbul imtahanlarında yüksək bal toplayanlar çoxdur. Amma elələri də var ki, qəbul imtahanlarında yüksək bal toplayıb, amma SABAH qruplarında oxumaq istəmir.

Sonda onu da qeyd edək ki, SABAH qruplarının yaradılması tələbələrə qapıları açıq edən, yüksək tədris imkanları verən, gələcəklərini təmin edən çox gözəl təşəbbüsdür. İnanırıq ki, yaxın gələcəkdə ölkəmizin bütün ali təhsil müəssisələrində bugünkü SABAH qrupları səviyyəsində təhsilin keyfiyyəti təmin ediləcək və gənclərimizin böyük məbləğdə pul xərcləyib xaricdə təhsil almasına ehtiyac qalmayacaqdır.

* SABAH abreviaturasının açılışı savadlı, bacarıqlı, hazırlıqlı deməkdir. Bu qruplar məhz bu keyfiyyətlərə malik tələbələrdən formalaşdırılır.

* Bu qrupa qəbul olan tələbə oxuduğu ixtisasın ən yüksək səviyyədə tədrisinin təşkil olunduğu ali təhsil müəssisəsinə köçürülür. Həmin qruplara da keyfiyyətli tədris bacarığı ilə seçilən müəllimlər dərs deyir.

* Hazırda SABAH qruplarında 7 ali təhsil müəssisəsi üzrə 688 tələbə təhsil alır.

* İndi ali təhsil müəssisələrində yalnız Azərbaycan bölməsi üzrə qruplar fəaliyyət göstərir.

* SABAH qruplarına qəbul mərkəzləşdirilmiş qaydada üç mərhələli müsabiqə yolu ilə, elektron proqram təminatı tətbiq olunmaqla həyata keçirilir.

* SABAH qruplarında dərs deyəcək müəllimlər də xüsusi seçim qaydaları əsasında müəyyənləşdirilir.

* SABAH qruplarında tədris xüsusi proqramlar əsasında aparılır.

* SABAH qruplarında təhsil alan tələbələr xüsusi imtiyazlara malikdir.

* SABAH qruplarında ödənişli əsaslarla təhsil alan tələbələrə də təqaüd verilir.

* SABAH qruplarında təhsilin tələbələrə verdiyi bir üstünlük də yataqxana ilə təminatdır. Həmin yataqxanada yaşayan tələbələrə həm də gündə üç dəfə pulsuz yemək verilir.

(Davamı 6-cı səhifədə)

# SABAH qrupları haqqında nə bilirik?

(Əvvəli 5-ci səhifədə)

### SABAH QRUPLARINA TƏLƏBƏLƏRİN QƏBULU QAYDALARI

*ÜMUMİ MÜDDƏALAR*

1.1. "SABAH qruplarına tələbələrin qəbulu Qaydaları" (bundan sonra Qaydalar) "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na uyğun olaraq hazırlanmışdır.

1.2. Bu Qaydalar SABAH qruplarına tələbələrin seçilməsi ilə bağlı müsabiqənin keçirilməsini tənzimləyir.

*MÜSABİQƏNİN TƏŞKİLİ*

2.1. Azərbaycan Respublikasında fəaliyyət göstərən ali təhsil müəssisələrində I kurs tələbələrinin SABAH qruplarına qəbulu mərkəzləşdirilmiş qaydada üç mərhələli müsabiqə yolu ilə (elektron ərizədəki göstəricilərin qiymətləndirilməsi, test imtahanı və müsahibə) elektron proqram təminatı tətbiq olunmaqla həyata keçirilir.

2.2. SABAH qruplarına müəyyən edilmiş ixtisaslar üzrə I tədris ilinin I semestrinin nəticələrinə görə orta müvəffəqiyyət göstəricisi 61 baldan aşağı olmayan tələbələr müraciət edə bilər.

2.3. Müsabiqədə tələbələr yalnız təhsil aldığı ixtisas üzrə iştirak edə bilər.

2.4. SABAH qruplarına tələbələrin qəbulunu həyata keçirmək üçün SABAH layihəsinin rəsmi İnternet saytında (www.sabah.edu.az) "Savadlı, Bacarıqlı və Hazırlıqlı ("SABAH") tələbələr" bu Qaydalar, "Elektron ərizə forması", "Elektron ərizənin doldurulmasına dair təlimat" və "Şəxsi səhifə" yerləşdirilir.

2.5. SABAH qruplarına tələbələrin qəbul prosesinin səmərəli təşkili və keçirilməsi üçün Təhsil Nazirliyi tərəfindən müsabiqə komissiyası və imtahanın nəticələri ilə bağlı şikayətlərə baxılması məqsədilə apelyasiya komissiyası yaradılır.

2.6. Müsabiqədə iştirak etmək üçün SABAH qruplarının rəsmi İnternet saytına (www.sabah.edu.az) daxil olub elektron ərizə doldurulmalıdır. Elektron ərizələrin qəbulu vaxtı Təhsil Nazirliyi tərəfindən hər il müəyyənləşdirilir və elan edilir.

2.7. Elektron ərizələrin qəbulu başa çatdıqdan 10 (on) təqvim günü sonra ərizəsi təsdiqlənmiş namizədlər II mərhələnin test imtahanının keçirilmə vaxtı və məkanı barədə elektron formada bildiriş göndərilməklə məlumat əldə edirlər.

2.8. Elektron ərizə əsasında müsabiqənin I mərhələsində elektron proqram təminatı vasitəsilə hər bir namizədin qiymətləndirilməsi aparılır.

2.9. SABAH qruplarına tələbələrin qəbulu üzrə müsabiqənin II mərhələsində test imtahanın keçirilməsi üçün Təhsil Nazirliyi tərəfindən "Test bankı" hazırlanır. Test imtahanı xarici dil və məntiq komponentləri üzrə aparılır.

2.10. Müsabiqə iştirakçıları imtahanın başlanmasına 1 (bir) saat qalmış qeydiyyatdan keçməlidirlər. Bunun üçün şəxsiyyət vəsiqəsinin əsli təqdim edilir. Şəxsiyyəti təsdiq edən sənəd təqdim olunmadıqda, namizəd imtahana buraxılmır.

2.11. Hər hansı bir səbəbdən göstərilən vaxtda imtahanda iştirak etməyənlər üçün təkrar imtahan keçirilmir.

2.12. "Test suallarının cavablandırılmasına dair təlimat"a uyğun olaraq imtahanda iştirak edən hər bir namizədə fərdi olaraq xarici dil üzrə 25 sual və məntiq üzrə 25 sual olmaqla, cəmi 50 sual təqdim edilir. Sualların cavablandırılmasına 1,5 saat vaxt ayrılır.

2.13. Hər bir düzgün cavab 1 balla qiymətləndirilir.

2.14. Müsabiqənin I və II mərhələləri üzrə qiymətləndirmə nəticələri Təhsil Nazirliyinin saytında dərc edilir.

2.15. Topladıqları ümumi bal əsasında iştirakçılar III mərhələdə iştirak etməyə dəvət olunurlar.

2.16. Müsabiqənin III mərhələsinə buraxılmış namizədlər müsahibə üçün qeyd olunan tarixdə şəxsi işini (elektron ərizənin surəti, diplomlar və sertifikatların surəti və şəxsiyyət vəsiqəsinin surətini) müsabiqə komissiyasına təqdim edirlər.

2.17. Müsahibə hər bir ixtisas üzrə Təhsil Nazirliyi tərəfindən təyin olunmuş üç nəfərdən ibarət səriştəli komissiya tərəfindən şifahi formada aparılır. Müsahibədə namizədin seçdiyi ixtisasa marağı, bu sahədəki bilikləri və ümumi dünyagörüşü qiymətləndirilir.

2.18. Bütün mərhələlər üzrə yekun qiymətləndirmə aşağıdakı meyarlar əsasında həyata keçirilir.

2.18.1. tələbənin akademik göstəriciləri;

2.18.2. II mərhələ zamanı keçirilən test imtahanının nəticəsi;

2.18.3. tələbənin motivasiyası.

2.19. I mərhələnin qiymətləndirilməsinə təsir edən elektron ərizədəki məlumatlarla təqdim edilən sənədlər arasında uyğunsuzluq halları aşkarlandıqda, həmin namizəd müsabiqədən kənarlaşdırılır.

2.20. Müsabiqənin yekun nəticələrinə əsasən SABAH qruplarına qəbul edilən tələbələr müəyyənləşdirildikdən sonra onların siyahısı Azərbaycan Respublikası Təhsil Nazirinin əmri ilə təsdiq olunur, Nazirliyin İnternet səhifəsində və SABAH qruplarının rəsmi saytında yerləşdirilir, müvafiq siyahılar baza ali təhsil müəssisələrinə göndərilir.

**Yusif ƏLİYEV,**
**"Azərbaycan müəllimi"**
**10 oktyabr 2014-cü il №39 (8606)**

# Tələbələrimizə sertifikatlar təqdim edilib



Oktyabr ayının 17-də Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun maliyyə dəstəyi, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşkilati dəstəyi ilə ADPU-nun Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin IV kurs tələbəsi Gülnaz Quliyevanın 5-ci qrant müsabiqəsində qazandığı adlı layihə həyata keçirilib. Layihənin açılışında ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev çıxış edib və tələbə-gənclərə gələn ilin yayında ilk dəfə Bakıda keçiriləcək Bakı-2015 Avropa Oyunlarında könüllü olmağı tövsiyə edib.



Sonra layihənin rəhbəri Gülnaz Quliyeva çıxış edərək layihə haqqında məlumat verib və könüllülərə uğurlar arzulayıb. Daha sonra Bakı-2015 Avropa Oyunlarının Təşkilat Komitəsinin nümayəndələri çıxış edərək Bakıda keçiriləcək Avropa Oyunları haqqında ətraflı məlumat veriblər. Tədbir zamanı tələbələrə bukletlər və məlumat kitabçaları paylanılıb, həmçinin ADPU-nun İnzibati-təsərrüfat işləri üzrə prorektoru, texnika elmləri üzrə fəlsəfə doktoru Səfər Hüseynov təşkilati işlərdə fəal iştirak edən tələbələrə sertifikatlari təqdim edib.

Sonda xatirə şəkli çəkdirildi.

**"Gənc müəllim"**

# ƏMƏKDAŞLARIMIZ BEYNƏLXALQ SİMPOZİUMDA



Məlum olduğu kimi, UNESKO böyük türk ədibi və mütəfəkkiri İsmayıl bəy Qaspıralının vəfat etməsinin 100-cü ildönümü ilə əlaqədar olaraq 2014-cü ili "İsmayıl bəy Qaspıralı ili" elan etmişdir. Bununla əlaqədar olaraq Türk dünyasının görkəmli mütəfəkkiri İsmayıl bəy Qaspıralının xatirəsinə həsr olunmuş silsilə tədbirlər keçirilir. Belə tədbirlərdən biri də 15-17 oktyabr tarixlərində Türkiyə Respublikasının İstanbul şəhərində keçirilən "Qaspıralı İsmayıl bəyin ölümünün 100-cü ilində dildə, fikirdə, işdə, birlikdə haradayıq?" adlı beynəlxalq simpoziumdur. Krım Mühəndislik Pedaqoji Universiteti, Türk Ocaqlarının İstanbul Şöbəsi və İstanbul Universitetinin dəstəyilə keçirilən beynəlxalq simpoziumda ADPU-nu "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının müdiri, professor Elman Quliyev, elmi işçilər - Leyla Kərimova və Aytən Abbasova təmsil etmişlər. Qeyd edək ki, "Qaspıralı İsmayıl bəyin ölümünün 100-cü ilində dildə, fikirdə, işdə, birlikdə haradayıq?" adlı beynəlxalq simpoziumun açılış mərasimi İstanbul Universitetinin Cemil Bilsel konfrans salonunda baş tutdu. Simpoziumda Azərbaycan, Yaponiya, Krım, Rusiya, Tatarıstan, eləcə də Türkiyənin müxtəlif universitetlərindən olan elm adamları iştirak etmişlər.



Türk dünyasının müxtəlif ərazilərindən tədbirə qatılan elm adamları bu simpoziumda müxtəlif və maraqlı məruzələrlə çıxış etmişlər. Adıçəkilən beynəlxalq simpoziumda professor E.Quliyev "İsmayıl Qaspıralının əsərlərində qadın mövzusu", A.Abbasova "İsmayıl bəy Qaspıralının dildə, fikirdə, işdə, birlikdə düşüncəsinin Cengiz Dağcı əsərlərində təzahürləri", L.Kərimova isə "Qaspıralı İsmayıl bəyin dildə, fikirdə, işdə, birlikdə ideologiyasının Mehmet Akif Ersoy əsərlərinə təsiri" adlı məruzələrlə çıxış etmişlər. Onların məruzələri simpozium iştirakçıları tərəfindən bəyənilmiş və yüksək qiymətləndirilmişdir. Tədbirdə iştirak edən simpozium iştirakçılarının hər biri fəxri fərman və hədiyyələrlə təltif edilmişlər.

**Elnurə Paşayeva,**
**"Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının əməkdaşı**

## "RAGB: dialoq və fəaliyyət" mövzusunda V konfrans keçirilib

Rusiya Federasiyasının paytaxtı Moskva şəhərinin "Swissotel" otelinin konfrans zalında Rusiyanın Azərbaycanlı Gənclər Birliyinin "RAGB: dialoq və fəaliyyət" mövzusunda V konfransı keçirilib. Konfransda Heydər Əliyev Fondunun vitse-prezidenti, RAGB-nin sədri Leyla Əliyeva, Azərbaycanın Rusiyadakı fövqəladə və səlahiyyətli səfiri Polad Bülbüloğlu, Gənclər və İdman Nazirinin müavini İntiqam Babayev, Ümumrusiya Azərbaycanlılar Konqresinin (ÜAK) prezidenti Məmməd Əliyev, Rusiya Dövlət Dumasının milli məsələlər üzrə komitəsi sədrinin birinci müavini Mixail Starşinov, Rusiya Federasiya Şurasının üzvü İqor Morozov, Moskva Şəhər Mədəniyyət Departamenti rəhbərinin müavini Vladimir Filippov və təşkilatın fəalları çıxış etmişlər.

500 nəfər gəncin iştirak etdiyi konfrans rəsmi hissədən sonra işini "Qafqazda bioloji müxtəlifliyin bərpası üzrə beynəlxalq əməkdaşlıq: nailiyyətlər və imkanlar", "Azərbaycan bu gün", "Azərbaycan səhiyyəsi islahatlar yolunda" və "Bakı-2015" seksiyalarında davam etdirmişdir.

Qeyd edək ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) sədri Sahil Qələndərov da "Bakı-2015" seksiyasında iştirak etmişdir.

# X ə b ə r l ə r

## Tələbələrimiz uşaq evində

Qurban bayramı xalqımızın ən əziz və müqəddəs bayramlarından biridir. Bu əziz bayram münasibətilə Səbail Rayon Gənclər və İdman İdarəsinin təşkilati dəstəyi və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü ilə Filologiya, Riyaziyyat və Biologiya fakültələrinin tələbələri müxtəlif uşaq evlərini ziyarət etmişlər. Belə ki, onlar oktyabr ayının 6-da Qaradağ rayonunun "Sahil" qəsəbəsində yerləşən fiziki qüsurlu uşaqlar evini, oktyabrın 7-də isə Sabunçu rayonunun Maştağa qəsəbəsində yerləşən uşaq evini ziyarət etmişlər.

Ziyarət zamanı tələbə-gənclərimiz uşaqlara müxtəlif bayram hədiyyələri, həmçinin lazımi geyim və ərzaq məhsulları vermiş, uşaqlarla rəqs edib onları əyləndirmişlər. Sonra bayram süfrəsi açılmış, uşaqlarla xatirə şəkli çəkdirilmişdir.

## "Azərbaycan tarixini öyrənək!" adlı bilik müsabiqəsi

Oktyabr ayının 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) dəstəyi ilə Dünya Azərbaycanlı Gənclərinin Beynəlxalq Həmrəyliyi Cəmiyyətinin (DAGBHC) tələbə-gənclər arasında "Azərbaycan tarixini öyrənək!" adlı bilik müsabiqəsi keçirilib. Öncə TGT-nin sədri Sahil Qələndərov tələbələri salamlayaraq onlara uğurlar arzulayıb və layihə haqqında ətraflı məlumat vermək üçün sözü DAGBHC-nin prezidenti Tofiq Əlizadəyə verib. Tofiq Əlizadə öz çıxışında tələbərə Azərbaycan tarixi ilə bağlı keçirilən layihələrin önəmi haqqında dolğun məlumat verib və vətəndaş olaraq hər birimizin milli tariximizi dərindən öyrənməli olduğunu vurgulayıb.

Məlumat üçün qeyd edək ki, müsabiqənin 1-ci mərhələsində 100 nəfər tələbə işitrak edib və onlara 20 sual verilib. Uğurlu nəticə göstərən tələbələr 2-ci mərhələyə keçiblər. 2-ci mərhələdə isə iştirakçılara 25 sual verilib. İlk 4 yer üçün hədiyyə və diplomlar təqdim olunub. I və II yerə Tarix fakültəsinin I kurs tələbələri Rəşad Əsgərov və Fidan Tağıyeva, III və IV yerlərə isə Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin I kurs tələbələri Röyal Qurbanov və Ramazan Qallacov layiq görülüblər.

## Bilik Olimpiadası

Oktyabr ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı və "Prestij-S" Tədris Mərkəzinin dəstəyi ilə universitetin IV kurs tələbələri arasında Bilik Olimpiadası keçirilmişdir. İlk olaraq TGT-nin sədri Sahil Qələndərov tələbələri salamlayaraq onlara uğurlar arzulamışdır. Daha sonra "Prestij-S" Tədris Mərkəzinin direktoru Samid Səfərov tələbələrə olimpiada qaydaları haqqında məlumat vermişdir. Olimpiadada 100-ə yaxın tələbə iştirak etmişdir.

## "Motivasiyaedici amil - sən özünsən" adlı təlim

Oktyabr ayının 16-da Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqında (ATGTİ) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) Biologiya fakültəsinin təşkilatçılığı ilə "Gənc Maarifçi Pedaqoqlar Klubu"nun sədri, təlimçi Ağaəhməd Göyüşovun təqdimatında "Motivasiyaedici amil-Sən Özünsən" adlı təlim keçirilmişdir. TGT-nin Biologiya fakültəsinin sədri Xoşqədəm Həsənlinin verdiyi məlumata görə, təlimin daha səmərəli və effektli olması üçün təlimdə müxtəlif slaydlar və videoçarxlar nümayiş etdirilmişdir. Təlimdə 30 nəfər tələbə iştirak etmişdir.

**Mətbuat və informasiya şöbəsi**

# ADPU-da kitab yarmarkası

Oktyabrın 13-15-i ADPU-nun tələbələri üçün özəl yaşantılarla yaddaşqalan olmuşdur. “Qanun” nəşriyyatı ilə “Əli və Nino” kitab evinin birgə layihəsi əsasında tələbələrə təqdim edilən əsərlər 20% endirimlə satışa çıxarılmışdı.

Yarmarka çeşid bolluğu ilə yadda qalmışdır. Belə ki, istənilən oxucu zövqünə uyğun kitab əldə etmək imkanında olmuşdur. Respublikamızın keçdiyi tarixi yol və qanunlarımızla maraqlananlar “İstiqlal”, “Bakının tarixi”, M.Ə.Rəsulzadənin müəllifi olduğu “Əsərləri (1917 aprel 1918)” və “Əsərləri (1918 aprel 1920), o cümlədən “Azərbaycan Respublikasının Konstitusiyası”, “Azərbaycan Respublikasının Mülki Məcəlləsi”, “Azərbaycan Respublikasının Seçki Məcəlləsi, “Azərbaycan Respublikasının Dövlət Maliyyəsi haqqında normativ hüquqi aktlar”, “Azərbaycan



Respublikasının Miqrasiya Məcəlləsi”, “Azərbaycan Respublikasının Torpaq qanunvericiliyi”, “Hüquq ensiklopediyası”, “İngilis-Azərbaycan böyük hüquq lüğəti”, dini mövzularla maraqlananlar “Həzrət Əli”, “İmam Əli”, tarixi şəxsiyyətlərin ömür yolu haqqında bilgilərini zənginləşdirmək istəyənlər “Nadir şah”, “Stalin”, “Napoleon”, “Birinci Pyotr”, “Kleopatra”, “Adolf Hitler”, “Tamerlan” kitablarını əldə etmək imkanında olmuşlar. Klassiklərimiz seriyasından F.Dostoyevskinin “Cinayət və cəza”, “Yeniyetmə”, “Alçaldılmışlar və təhqir edilmişlər”, “Ölülər evindən qeydlər”, İ.Şıxlının “Dəli Kür”, A.Dümanın “Üç müşketyor”, T.Drayzerin “Kerri bacı”, J.Sandın “İndiana”, Ceyn Ostinin “Qürur və qəzəb” kimi əsərləri təqdim olunurdu.

“Qanun” nəşriyyatının satış meneceri Kənan Muxtarovun sözlərinə görə, çeşidin bolluğuna baxmayarq, hətta, tələbələr onları maraqlandıran kitabları sifariş də edə bilərlər. Tələbələr üçün daha maraqlı cəhət yarmarkada xarici ölkə müəlliflərinin əsərlərinə daha çox yer verilməsi və kitabların 20% güzəştlə satılmasıdır.

K.Muxtarov tələbə-gənclər arasında motivasiya yönümlü kitablara və müasir dünya ədəbiyyatına meyilin daha çox olduğunu, bu sırada detektiv ədəbiyyata daha üstünlük verildiyini söylədi. O, eyni zamanda ADPU-da kitab yarmarkasının keçirilməsinə göstərdiyi köməkliyə görə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədova öz dərin təşəkkürünü bildirdi.

**A.İSGƏNDƏROV**

# «Səbail rayon gəncləri narkomaniyaya yox deyir!»

## ADPU-da bu mövzuda tədbir keçirilib

Oktyabr ayının 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Səbail Rayon İcra Hakimiyyəti (RİH) və Azərbaycan Respublikası Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının İşçi Qrupunun birgə təşkilatçılığı ilə «Səbail rayon gəncləri narkomaniyaya yox deyir!» mövzusunda tədbir keçirilmişdir. Tədbirdə Səbail rayonunda “Narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə və narkomanlığa qarşı mübarizəyə dair 2013-2018-ci illər üçün Dövlət Proqramı”nın icrası ilə bağlı görülən işlər müzakirə olunaraq bəşəriyyətin gələcəyi üçün ən dəhşətli bəla olan narkomaniyaya qarşı mübarizədə yalnız dövlətin deyil, eləcə də cəmiyyətin hər bir üzvünün fəal rol oynamasının zəruriliyi xüsusi qeyd olunmuşdur.

Səbail RİH-in və Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının İşçi Qrupunun rəhbərliyinin, pedaqoji işçilərin, ictimaiyyət nümayəndələrinin və ali məktəb tələbələrinin iştirakı ilə keçirilən tədbiri Səbail RİH-in başçısının müavini, Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Səbail rayon komissiyasının sədri Eldar Ağayev məruzə ilə çıxış etmişdir. Eldar Ağayev öncə belə vacib bir tədbirin ADPU-da keçirilməsinə verdiyi dəstəyə görə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədova öz dərin təşəkkürünü bildirdi.

Eldar Ağayev bildirmişdir ki, bugünkü tədbir çox vacib və aktual məsələyə - bəşəriyyət üçün ən böyük bəlalardan birinə çevrilmiş narkomaniyaya həsr olunmuşdur. Bu bəlanın törətdiyi fəsadlara qarşı mübarizə bu gün xüsusilə aktual xarakter daşıyır. Narkomaniya və narkotizm ərazi, milli, dini və digər sərhədlər tanımayan beynəlxalq probleme çevrilib. Narkomaniyaya qarşı mübarizə tədbirlərinin günbəgün gücləndirilməsinə baxmayaraq, o, yoluxucu xəstəlik kimi yayılmaqda, coğrafiyasını genişləndirməkdədir. Azərbaycan dövlətinin bu bəlanın qarşısının alınması istiqamətində həyata keçirdiyi tədbirlər davamlılığı ilə diqqət çəkir. Belə ki, narkomaniya əleyhinə aparılan tədbirlər hər zaman ölkə rəhbərliyinin diqqət mərkəzində olmuş, onların gücləndirilməsi istiqamətində bir sıra işlər görülmüşdür. Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev qeyd etmişdir ki, «Narkomaniya və narkobiznes ilə mübarizə hər bir ölkənin, xalqın, millətin fiziki və şüuri sağlamlığı uğrunda aparılan mübarizədir». Bu, Ulu Öndərin bu bəşəri təhlükəyə verdiyi qiymətdir. Ölkəmizdə narkomaniya və onun fəsadları ilə mübarizə sahəsində görülən işlərin gücləndirilməsi və koordinasiya edilməsi məqsədi ilə Ulu Öndərin imzaladığı müvafiq Fərmana əsasən 1996-cı ildə Azərbaycan Respublikası Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyası yaradılmışdır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamları əsasında təsdiqlənən və 2007-2012-ci illəri əhatə edən Dövlət Proqramının icra müddəti başa çatdığından ölkə başçısının müvafiq sərəncamı ilə “Narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə və narkomanlığa qarşı mübarizəyə dair 2013-2018-ci illər üçün Dövlət Proqramı” təsdiq olunmuşdur.

Dövlət Proqramının məqsədi ölkədə narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə və narkomanlığa qarşı mübarizənin gücləndirilməsi, antinarkotik təbliğat, narkotiklərin qanunsuz alınması, narkomanlığa düçar olmuş şəxslərin müalicə edilməklə sağlam həyata qaytarılması, müalicə-bərpa sahəsindəki fəaliyyətin müasir dövrün tələblərinə uyğunlaşdırılması, bu sahədə qanunvericiliyin təkmilləşdirilməsi, cəza tədbirlərinin səmərəliliyinin öyrənilməsi üçün elmi və praktik araşdırmala-




rın aparılması, beynəlxalq əməkdaşlığın inkişaf etdirilməsi və digər genişmiqyaslı məsələlərdən ibarətdir.

Respublika əhalisi və xüsusilə gənclər üçün böyük təhlükə mənbəyi olan «ağ ölümə» qarşı həyata keçirilən genişmiqyaslı tədbirlər paytaxt Bakı şəhərinin mərkəzi rayonu olan Səbail rayonunda gündəlik və daimi xarakter daşıyır.

Səbail RİH-in başçısının sərəncamı ilə RİH-də yaradılmış Narkomanlığa və narkotik vasitələrin qanunsuz dövriyyəsinə qarşı mübarizə üzrə rayon komissiyasına rayonun hüquq-mühafizə orqanlarının, rayon Gənclər və İdman İdarəsinin təmsilçiləri, habelə ictimaiyyət nümayəndələri daxil edilmişlər. Təsdiq olunmuş tədbirlər planına uyğun olaraq Komissiyada mütəmadi olaraq narkomanlığa və narkotik vasitələrin qanunsuz dövriyyəsi ilə bağlı rayonda görülən işlər müzakirə olunur, hüquq-mühafizə orqanları tərəfindən qanunsuz dövriyyədən çıxarılmış narkotik vasitələrin ləğv olunması həyata keçirilir, məktəblilər, yeniyetmələr, şagird və tələbələr arasında maarifləndirmə işlərinə xüsusi diqqət yetirilir.

Komissiyanın təşkilatçılığı ilə rayonun ali və orta məktəblərdə mütəmadi olaraq narkomanlığa, yeniyetmə və gənclər arasında müxtəlif zərərli vərdişlərin yayılmasının əleyhinə kütləvi tədbirlər təşkil olunur. Bu maarifləndirici tədbirlərdə Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının İşçi Qrupunun üzvlərinin, aidiyyətli nazirlik və komitələrin nümayəndələrinin, Səbail Rayon Polis İdarəsinin və Səbail Rayon Məhkəməsinin əməkdaşlarının, həkim-narkoloqların, həmçinin rayonun bütün ali və orta təhsil müəssisələrinin rəhbərlərinin, şagird və tələbələrin, ağsaqqalların və din xadimlərinin, həmçinin bir sıra qeyri-hökumət və beynəlxalq təşkilatlarının nümayəndələrinin iştirakı təmin olunur. Tədbirlərdə bu gün bütün dünya üçün ən təhlükəli bəlalardan biri olan narkomaniyaya qarşı Səbail rayonunda aparılan profilaktiki tədbirlər barədə məlumat verilir, filmlər və roliklər nümayiş etdirilir.

Ötən bir il ərzində ADPU-da və Azərbaycan Dövlət İqtisad Universitetində narkomaniya ilə bağlı elmi-praktiki konfrans və dəyirmi masalar, eləcə də 26 iyun-BMT-nın «Narkotiklərlə mübarizə günü» ilə bağlı «Səbail rayon gəncləri narkomanlığa yox deyir!» mövzusunda aksiya, Səbail rayon mərkəzləşdirilmiş Kitabxana Sisteminin Mərkəzi Kitabxanasında, Badamdar və Bibiheybət qəsəbə mədəniyyət evlərində «Narkomaniya bəşəriyyətin bəlasıdır» mövzusunda tədbirlər təşkil olunmuş, rayonun orta məktəblərində «Narkomaniyanın fəsadları», «Narkomaniya cinayətkarlıq yoludur», «Narkomaniyaya yox deyək!» mövzularında görüş və dəyirmi masalar, rəsm, inşa yazı müsabiqələri və sərgilər, həmçinin rayonun 49, 50, 51, 203 və 236 nömrəli orta məktəblərində “Siyasi maarifçilik” İctimai Birliyi ilə birgə “Narkomanlığa yox deyək!” mövzusunda silsilə tədbirlər keçirilmişdir.

Narkomanlıqla bağlı hüquqpozmalara meyilli olan yetkinlik yaşına çatmayanlar və gənclər Səbail RPİ-də qeydiyyata alınaraq idarənin əməkdaşları tərəfindən nəzarətdə saxlanılırlar. Onlarla müvafiq işlərin aparılması və maarifləndirilmələri üçün hüquq-mühafizə orqanları, yerli bələdiyyələr, təhsil işçiləri və RİH-də fəalyyət göstərən müvafiq komissiyalar arasında əlaqələrin genişləndirilməsi üçün lazımi tədbirlər görülür.

Səbail RPİ-nin əməkdaşları tərəfindən 2014-cü ilin 9 ayı ərzində həyata keçirilmiş əməliyyat - axtarış tədbirləri nəticəsində 72 fakt üzrə 9 kq



823,392 qram narkotik vasitə qanunsuz dövriyyədən çıxarılmışdır.

E.Ağayev çıxışına davam edərək bildirib ki, narkomaniyaya qarşı aparılan işlərin əsas istiqamətlərindən birinin yeniyetmələrin asudə vaxtlarından səmərəli istifadə edilməsi olduğundan həyata keçirilən təbliğati işlərlə yanaşı, rayonda yeniyetmə və gənclər arasında sağlam həyat tərzinin təbliğ edilməsi, onların asudə və istirahət vaxtlarının səmərəli təşkili, idmana olan maraqlarının artırılması istiqamətində tədbirlərə ciddi fikir verilir. Hərbi-vətənpərvərlik, idman, turizm yarışları, intellektual oyunlar, bilik yarışları və sair çoxsaylı maraqlı tədbirlər təşkil olunur, keçirilən tədbir və idman yarışlarına daha çox yeniyetmə və gəncin cəlb olunması təmin edilir.

Tətillər zamanı, xüsusilə də, yay aylarında yeniyetmə və gənclərin asudə vaxtlarının səmərəli təşkili, sağlam həyat tərzinin təbliği ilə bağlı idman və digər tədbirlərin keçirilməsinə xüsusi diqqət yetirilir. Bununla əlaqədar olaraq Səbail RİH-in təşəbbüsü və Daxili İşlər Nazirliyinin (DİN) Daxili Qoşunlarının Komandanlığı ilə birgə layihə əsasında Quba rayonunda hər il 250 nəfər uşaq üçün son 9 il ərzində keçirilmiş hərbi-vətənpərvərlik təmayüllü «Şahinlər» yay istirahət düşərgəsi xüsusi əhəmiyyət kəsb edir. Bu ildən etibarən həmin tədbirlərə Müdafiə Nazirliyi ilə birgə Qusar rayonundakı hərbi hissədə təşkil olunmuş «Gənc Heydərçilər» yay düşərgəsi də əlavə olunmuşdur.

Səbail RİH tərəfindən rayonun mədəniyyət evlərində və uşaq yaradıcılıq mərkəzlərində fəaliyyət göstərən müxtəlif dərnəklərin, idman bölmələrinin işi diqqət mərkəzində saxlanılır. İdman tədbirləri rayonun orta məktəblərinin idman qurğularında, əsaslı təmir olunmuş həyətlərdə yaradılmış mini-futbol və voleybol meydançalarında, istirahət guşələrində keçirilir. Hazırda Səbail RİH tərəfindən Badamdar qəsəbəsində idman kompleksinin tikintisi işləri aparılır ki, bu da gələcəkdə gənclərimizin idmana cəlb olunmaları və sağlam böyümələrində mühüm rol oynayacaqdır.

Bütövlükdə isə narkomaniyaya qarşı mübarizə tədbirləri, ilk növbədə, yeniyetmə və gənclər arasında maarifçilik işləri daim Səbail RİH-in rəhbərliyinin diqqət mərkəzindədir və bu istiqamətdəki işlər gələcəkdə daha geniş şəkildə davam etdiriləcəkdir.

Tədbirdə çıxış edən Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının İşçi Qrupu rəhbərinin müavini Vasif Quliyev, DİN-in Baş Narkotiklərlə Mübarizə İdarəsinin baş əməliyyat müvəkkili Ağakişi İsmayılov, Təhsil Nazirliyinin nümayəndəsi Hilal Salmanov, Səhiyyə Nazirliyinin Narkoloji Mərkəzinin həkim-narkoloqu Asif Kəngərli ölkə Prezident cənab İlham Əliyevin 2013-cü il 24 iyun tarixli Sərəncamı ilə təsdiq edilmiş “Narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə və narkomanlığa qarşı mübarizəyə dair 2013-2018-ci illər üçün Dövlət Proqramı”nın narkomanlığa qarşı mübarizənin gücləndirilməsi, antinarkotik təbliğat, narkomanlığa düçar olmuş şəxslərin sağlam həyata qaytarılması, qanunvericiliyin təkmilləşdirilməsi və digər məsələlərlə bağlı qarşıya ciddi vəzifələr qoyduğunu qeyd etdilər. Bildirdilər ki, narkomaniya cəmiyyətimizə, dövlətimizə və ümumilikdə bəşəriyyətə böyük zərbə vurur. Çıxışlarda narkomaniyaya qarşı birgə mübarizə aparılmısının vacibliyi xüsusi vurğulanmışdır.

Tədbirdə tələbə-gənclərə bu bəlaya qarşı mübarizə aparmaq üçün tövsiyələr, dəyərli məsləhətlər verildi. Eyni zamanda tədbir iştirakçılarının təklifləri dinlənilərək onları maraqlandıran suallar cavablandırıldı.

Tədbirin sonunda hər bir iştirakçıya narkomaniyanın fəsadlarını göstərən broşuralar paylanıldı.

**Mətbuat və informasiya şöbəsi**

# "2014-cü il bələdiyyə seçkiləri ilə bağlı aktiv seçki hüququna malik vətəndaşların maarifləndirilməsi"

## ADPU-da bu mövzuda tədbir keçirilib

Oktyabr ayının 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda Müstəqil Dövlətlər Birliyinin İştirakçısı Olan Dövlətlərin Parlamentlərarası Assambleyası Şurasının Katibliyinin Demokratiyanın, Parlamentarizmin İnkişafının və Vətəndaşların Seçki Hüquqlarına Riayət Olunmasının Monitorinqi Beynəlxalq İnstitutunun Bakı Filialı və "Kreativ Vətəndaş Cəmiyyətinin İnkişafına Dəstək" İctimai Birliyi "2014-cü il bələdiyyə seçkiləri ilə bağlı aktiv seçki hüququna malik vətəndaşların maarifləndirilməsi" mövzusunda tədbir keçirmişlər. Tədbiri DİMBİ-nin Bakı Filialının baş məsləhətçisi Rəmzi Yusifov açaraq bu tədbirin təlim xarakteri daşıdığını bildirmiş və tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü ifadə etmişdir. R.Yusifov bildirmişdir ki, Mərkəzi Seçki Komissiyasının (MSK) qərarı ilə bu il dekabr ayının 23-də Azərbaycanda növbəti bələdiyyə seçkiləri keçiriləcəkdir. Say baxımından bu, ölkəmizdə keçirilən 4-cü bələdiyyə seçkiləridir. O, tələbə-gənclərin qarşıdan gələn bələdiyyə seçkiləri ilə bağlı maarifləndirilməsinin mühüm əhəmiyyət kəsb etdiyini xüsusi vurğulamış və bu seçkilərlə bağlı aşağıdakı vacib hüquqi məlumatları onların diqqətinə çatdırmışdır.

**Bələdiyyə anlayışı**

Özünüidarəetmə demokratik cəmiyyətin idarə olunması sistemində çox mühüm yer tutur. Özünüidarəetmə idarəetmənin demokratikləşməsi səviyyəsinin göstəricisi olub, vətəndaşlara qərar qəbul edilməsi prosesində geniş iştirak etmək, işlədiyi təşkilatda, yaşadığı ərazilərdə həyat tərzinin axarına təsir göstərmək imkanını təmin edir.

Özünüidarəetmə sahə və ərazi miqyasında ola bilər. Ərazi miqyasında özünüidarəetmə daha geniş yayılmışdır. Onun əsas forması bələdiyyədir.

Bələdiyyələr yerlərdə əhalinin özünüidarəsinin və yerli imkanlardan istifadəsinin başlıca təşkilati formasıdır. İnkişaf etmiş demokratik dövlətlərdə (ABŞ, Türkiyə, Almaniya, Fransa, Yaponiya) bələdiyyə idarəetməsi sahəsində uzun illər ərzində böyük təcrübə toplamışdır.

Tarixə nəzər salsaq, görərik ki, sovet dövrünə qədər də Azərbaycanda bələdiyyə sistemi mövcud olub. 1905-1911-ci illərdə Azərbaycanda Bakı meriyası mövcud olub və həmin dövrdə azərbaycanlı iş adamı, xeyriyyəçi Hacı Zeynalabdin Tağıyev də bu meriyanın üzvü olaraq şəhərin sosial sahələri ilə bağlı problemlərin həll edilməsində özü təşəbbüskar olub. Bu tarixi fakt sübut edir ki, dövlətçilik tariximizdə yerli özünüidarəetmə təsisatı olub. Yəni bu sahədə təcrübə var, milli ənənəmiz tarixən mövcuddur.

Ölkəmizdə bələdiyyələrin yaranmasından keçən qısa dövr ərzində onların rolu getdikcə artır, nüfuz dairələri genişlənir. Müasir Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndərimiz Heydər Əliyev yerli bələdiyyələrin ölkəmizdə demokratik proseslərin vacib hissəsi, vacib istiqaməti olduğunu xüsusi qeyd etmişdir.



1995-ci ildə qəbul edilmiş ilk Azərbaycan Respublikasının Konstitutsiyasında bələdiyyələrin yaranması və onlara seçkilər keçirilməsi barəsində müvafiq müddəalar öz əksini tapmışdır. Azərbaycan Respublikasının Konstitusiyasının IV Bölməsinin IX Fəslində bələdiyyələrin işinin təşkilinə, səlahiyyətlərinə, qərarlarının icrasına və müstəqilliyinin təminatına dair maddələr əks olunmuşdur.

Konstitusiyamızın 142-ci maddəsində ölkəmizdə yerli özünüidarəni seçki əsasında yaradılan bələdiyyələrin həyata keçirdiyi, bələdiyyələrə seçkilər və bələdiyyələrin statusunun qanunla müəyyən olunduğu barədə; 143-cü maddədə bələdiyyələrin öz işini iclaslar, daimi və başqa komissiyalar vasitəsilə həyata keçirdiyi barədə məlumat verilir. 144-cü maddədə bələdiyyələrin səlahiyyətləri, 145-ci maddədə bələdiyyələrin qərarları sadalanır; Konstitusiyanın 146-cı maddəsində isə bələdiyyələrin müstəqilliyinin təminatları barədə məlumatlar öz əksini tapır.

Beləliklə, Konstitusiyanın dördüncü bölməsinin yerli özünüidarəetmə sahəsində qanunvericiliyin ümumi əsasını və ilkin təməlini təşkil etdiyinin şahidi oluruq. Bələdiyyələrə geniş mülkiyyətə sahib olmaq hüququ verilmişdir. Bələdiyyə mülkiyyəti - bələdiyyəyə mənsub olan bütün növ daşınar və daşınmaz əmlakdır. Bələdiyyələrin mülkiyyətində onun torpaqları xüsusi yer tutur. Müvafiq ərazi vahidi daxilində dövlət mülkiyyətində saxlanılan və xüsusi mülkiyyətə verilən torpaqlar çıxılmaqla qalan torpaqlar bələdiyyə mülkiyyətinə verilir.

Bələdiyyə mülkiyyətinə verilən torpaqlara daxildir:

- ümumi istifadədə olan torpaqlar;
- fiziki və hüquqi şəxslərin istifadəsində olan torpaqlar
- ehtiyat fondu torpaqları.

Azərbaycanda olan torpaqların təqribən 2 milyon hektarı və ya bütün respublika torpaqlarının 32%-i bələdiyyələrə verilmişdir. Bələdiyyələrin qarşısında duran əsas vəzifə Azərbaycan Konstitusiyası və qanunları ilə müəyyənləşdirilən yerli əhəmiyyətli sosial-iqtisadi inkişaf məsələlərini həll etmək, bununla da əhalinin maddi və mədəni həyat səviyyəsini yüksəltməkdir. Bu baxımdan, bələdiyyələrin mühüm vəzifələrindən biri onlara həvalə edilmiş ərazidə mövcud olan təbii, iqtisadi və intellektual potensialdan səmərəli istifadəyə nail olmaqdır.

Azərbaycanda yerli özünüidarəni həyata keçirən bələdiyyələrin üzvləri nisbi çoxluq sistemi əsasında çoxmandatlı seçki dairələri üzrə seçilirlər. Bələdiyyələrin səlahiyyət müddəti 5 ildir. Bələdiyyələrin səlahiyyət müddətinin hesablanması səsvermənin keçirildiyi gündən başlanır və yeni seçilən bələdiyyələrin birinci iclas günü başa çatır.



**Seçkilərin elan edilməsi müddəti**

Bələdiyyə seçkiləri səsvermə gününə azı 60 gün qalmış elan edilir. Səsvermə günü seçkilər keçirilən ərazidə iş günü hesab olunmur.

**Bələdiyyələrə üzv seçilmək hüququ**

Seçkilər günü 21 yaşı tamam olan (seçki günü də daxil olmaqla) və yaşı 21-dən yuxarı olan və müvafiq seçki dairəsində daimi yaşayan Azərbaycan Respublikasının vətəndaşları bələdiyyələrə üzv seçilə bilərlər.

**Bələdiyya seçkiləri zamanı səsvermə qaydası**

Seçici seçki bülletenində lehinə səs verəcəyi namizədlərin soyadından sağdakı kvadratlarda müvafiq bələdiyyə üzvlərinin sayına bərabər və ya bu saydan az sayda işarə qoyur. İşarə qoyulmuş kvadratlarım sayı bələdiyyə üzvlərinin sayından çoxdursa, səs etibarsız sayılır. Boş kvadratlarda heç bir işarə qoyulmamış səs etibarsız sayılır.

Seçki məntəqəsində səslərin hesablanması Seçki Məcəlləsinə uyğun həyata keçirilir. Səsvermə müddəti başa çatdıqda istifadə edilməmiş seçki bülletenləri səsvermə otağındakı müşahidəçilərin müşahidəsi ilə məntəqə seçki komissiyasının üzvləri tərəfindən sayılır və ləğv edilir. Həmin seçki bülletenlərinin sayı elan edilir və səsvermənin yekun protokolunda qeyd olunur. Məntəqə seçki komissiyasının sədri seçki qutularının möhür və plombların salamatlığını yoxlayır, məntəqə seçki komissiyasının üzvlərini və müşahidəçiləri bununla əyani surətdə tanış edərək seçki qutularını açır. Seçki qutuları növbə ilə açılır: əvvəlcə daşınan seçki qutusu, sonra isə daşınmaz seçki qutuları.

İlk növbədə daşınan seçki qutusundakı bülletenlər sayılır və hər bir namizədin lehinə verilmiş səslərin sayı müəyyənləşdirilir. Səsvermə günündən ən geci 2 gün keçənədək dairə seçki komissiyası dairə seçki dairəsi üzrə seçkilərin yekunlarını müəyyən edir.

Seçkilərdə iştirak edən və seçicilərin ən çox səsini toplayan namizədlər bələdiyyə üzvlərinin sayına bərabər olaraq müvafiq bələdiyyəyə üzv seçilmiş hesab edilirlər.

MSK səsvermə günündən başlayaraq ən geci 20 gün müddətində dairə seçki komissiyalarının (DSK) protokollarını yoxlayır və seçkilərin ümumi yekunları haqqında protokol tərtib edir.

DSK qeydə alınmış namizədlərin lehinə verilən səslərin sayı bərabər olduqda, bələdiyyəyə seçkiləri baş tutmamış hesab edir.

DSK və ya MSK bələdiyyə üzrə seçkiləri aşağıdakı hallarda etibarsız sayır:

~ Bələdiyyə üzrə səsvermə zamanı səsvermənin nəticələri etibarsız sayılmış seçki məntəqələrinin sayı həmin bələdiyyənin ərazisində olan seçki məntəqələrinin ümumi sayının 2/5 hissəsindən çoxunu təşkil etdikdə və ya ləğv edildikdə, o şərtlə ki, həmin seçki məntəqələrində seçicilərin sayı bələdiyyə üzrə qeydə alınmış seçicilərin ümumi sayının 1/4-dən coxunu təşkil etsin;

- məhkəmənin qərarı əsasında. MSK seçkilər günündən başlayaraq ən geci 25 gün müddətində ölkə üzrə bələdiyyə seçkilərinin yekunlarını elan edir. MSK tərəfindən müəyyən edilmiş nümunədə bələdiyyə üzvü seçilmək haqqında vəsiqə seçkilərin yekunları elan olunduqdan sonra 5 gün müddətində DSK tərəfindən verilir.

***

Tədbirdə tələbə-gəncləri maraqlandıran suallar cavablandırılmışdır.

**Könül MƏMMƏDOVA,**
**Tarix fakültəsinin III kursunun**
**303-cü qrup tələbəsi**

# Pedaqogika və psixologiya fakültəsində natiqlik təlimi



Oktyabr ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqogika və psixologiya fakültəsinin Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü ilə fakültənin I kurs tələbələri ilə "Auditoriyada Mən" adlı natiqlik təlimi keçirilib. Təlim Pedaqogika və psixologiya fakültəsinin auditoriyalarının birində reallaşıb.

Təlimdə çıxış edən Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi, fakültənin TGT sədri Ramid Seyfullayev ilk olaraq bu təlimin keçirilməsinə göstərdiyi köməkliyə görə fakültənin dekanı, dosent Şəhla Əliyevaya təşəkkür edib. O, I kurs tələbələrini ADPU TGT-nin tarixi, fəaliyyəti və layihələri ilə tanış edərək bildirdi ki, bu gün keçirilən təlim onlara gələcəkdə öz fikirlərini dolğun və sərbəst şəkildə ifadə etməyə yardımçı olacaq. Eyni zamanda bu tip təlimlərin, seminarların mütəmadi olaraq keçiriləcəyini, tələbələrimizin bunlardan yararlanaraq özlərini daha da inkişaf etdirmək imkanı əldə edəcəklərini bildirdi. 30-a yaxın I kurs tələbəsinin iştirak etdiyi bu təlimdə ADPU TGT-nin sədr müavini, "Gənc Maarifçi Pedaqoqlar Klubu"nun sədri, gənc təlimçi Ağaəhməd Göyüşov auditoriya qarşısında sərbəst çıxış etməyin və nitqin hazırlanması yolları, güclü natiq olmağın bəzi sirrləri, natiqliyə xas xüsusiyyətlər və onların inkişaf etdirilməsi haqqında məlumat verdi. Təlimin ümumi gedişini, iştirak edənlərin təlimdə, sual-cavabda fəal iştirakını nəzərə aldıqda təlimin uğurlu keçdiyini söyləmək olar.

Onu da qeyd edək ki, Pedaqogika və psixologiya fakültəsi belə təlimlərin mütəmadi təşkili və tələbələrimizin bu təlimlərdən yararlanmaları üçün hər zaman çalışmışdır və bundan sonra da öz fəaliyyətini bu istiqamətdə davam etdirəcəkdir.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin**
**II kurs tələbəsi,**
**TGT-nin fakültə sədri**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının dosenti Bəymmməd Cəbrayılova əzizi

**Hidayət İsmayılovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti

**Tamara Babayevanın**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təsviri incəsənət, rəsmxətt və onların tədrisi metodikası kafedrasının dosenti Saleh Quliyevə həyat yoldaşı

**Aynurə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyazi analiz kafedrasının dosenti Vaqif Məstəliyeva əzizi

**Telman Bayramovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının müəllimi Gülşən Musayevaya atası

**Əli kişinin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi psixologiya kafedrasının baş müəllimi Günəş Əfəndiyevaya həyat yoldaşı

**Fədlon Əfəndiyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi Mələk Məmmədovaya bacısı

**Şirin Paşayevanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi mətbəənin işçisi Tamara Qasımovaya həyat yoldaşı

**Qasım Qasımovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.


| Redaktor: A. Z. İSGƏNDƏROV | ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi, 68 ADPU, Tel.: 498-18-41 | Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır | ADPU-nun web-portalı: adpu.edu.az Fotolar Əli Səmədovundur Şəhadətnamə № 191 | Sifariş: 3865 Sayı: 1500 Çapa imzalanıb: 31.10.2014-cü il | ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir. |
|---|---|---|---|---|---|